**Müəllif: İmam Əhməd ibn Əli ibn Muhəmməd ibn Əhməd ibn Həcər əl-Əsqəlani**
**Tərcümə edən: Aydın Salehli**
**Redaktor: S. Səfərbəyov**
**İxtisas redaktoru: Ə. Musayev, M. Qarayev**
**Korrektor: G. Musayeva**

# ƏHMƏD ibn HƏCƏR əl-ƏSQƏLANİ
# ƏBƏDİ HƏYATA HAZIRLIQ

**Bu kitab Azərbaycan Respublikası Dini Qurumlarla İş üzrə Dövlət Komitəsinin razılığı ilə nəşr edilmişdir.**
**(DK-265/B 18/09/2009)**

بسم الله الرحمن الرحيم

## *Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

## *Tərcüməçidən*

Həqiqətən şükür və tərif yalnız Allaha məxsusdur! Biz Ona həmd edirik, Onu köməyə çağırırıq, Ondan bağışlanma və bizi doğru yola yönəltməyi diləyirik, nəfslərimizin şərindən və pis əməllərimizdən qorunmaq üçün yalnız Ona pənah aparırıq. Allah kimə hidayət verərsə o, doğru yolda olar, kimi azdırarsa onu doğru yola yönəldən tapılmaz. Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə haqqı olan məbud yoxdur, Onun şəriki yoxdur və şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir.

**"Ey iman gətirənlər! Allahdan Ona layiq olan tərzdə qorxun və ancaq müsəlman olduğunuz halda ölün!"**[1]

**"Ey insanlar! Sizi tək bir candan xəlq edən, onun özündən zövcəsini yaradan və onlardan da bir çox kişi və qadın *törədib yer üzünə* yayan Rəbbinizdən qorxun! Adı ilə birbirinizdən *cürbəcür şeylər* istədiyiniz**

[1] "Ali-İmran", surəsi, 102.

**Allahdan və qohumluq əlaqələrini kəsməkdən çəkinin! Həqiqətən, Allah sizə nəzarət edir".**[2]

**"Ey iman gətirənlər! Allahdan qorxun və doğru söz danışın ki, O, əməllərinizi islah etsin və günahlarınızı bağışlasın. Kim Allaha və Onun Elçisinə itaət etsə, böyük bir uğur qazanar".**[3]

Bizi müsəlman kimi yaradan, düz yola yönəldərək hidayət verən, aləmlərin Rəbbi, haqq-hesab gününün Hökmdarı olan Allaha şükürlər və həmd-sənalar olsun!

Hörmətli oxucu!

İslam dünyasının məşhur alimlərindən sayılan hicrətin 8-9 əsrlərində yaşamış ibn Həcər əl-Əsqəlaninin bu kitabını tərcümə etməyin bir çox səbəbləri olmuşdur. Belə ki, kitabın həcmi az olmasına baxmayaraq onun geniş sahələri əhatə edən məzmunu, Peyğəmbərimizdən ﷺ, səhabələrdən, alimlərdən və müdrik adamlardan varid olan dərin və mənalı rəvayətlər bir daha insanın yaradılış qayəsini bizə xatırladır və həyatın mənasını axtaran insanlara gözəl bir töhfədir. Kitab biz müsəlmanları günahlardan uzaq olmaqda, daima Axirəti yada salmaqda, təqvalı olmağımızda, vaxtı səmərəsiz keçirməməkdə, elmə yiyələnməkdə, əbədi həyata hazırlıqda mühüm bir vasitə ola bilər. Təqdim olunan kitab çox orijinal üslubda yazılmış, hədis və müdrik kə-

---

[2] "ən-Nisa", surəsi, 1.
[3] "əl-Əhzab", surəsi, 70-71.

lamların rəqəmli fəsillər üzrə çeşidlənməsi, bəzi səhabələr və alimlər haqqında qısa da olsa məlumatların verilməsi ümid edirik ki, oxucuda kitaba olan marağını bir daha artıracaq. Deməк olar ki, "Əbədi həyata hazırlıq" kitabı cəmiyyətimizin mənəvi cəhətdən təmizlənməsi istiqamətinə, dini maarifləndirməyə, əxlaqı dəyərlərin öndəmdə olmasına yönəlmiş bir addımdır.

**Aydın Salehli**
**29 Sentyabr 2009**

# İkili bab

Peyğəmbər ﷺ demişdir: "İki şey vardır ki, onlardan daha xeyirlisi yoxdur: Allaha iman gətirmək və müsəlmanlara xeyir vermək. Eləcə də iki şey vardır ki, onlardan daha pisi yoxdur: Allaha şərik qoşmaq və müsəlmanlara ziyan vurmaq".

❁❁❁

O həmçinin demişdir: "Çalışın alimlərlə oturub-durun, həm də hikmət sahiblərinin kəlamlarına qulaq asın. Çünki Uca Allah yağış suyu ilə ölü torpağı diriltdiyi kimi, ölü qəlbi də hikmət nuru ilə dirildir".

❁❁❁

Əbu Bəkr əs-Siddiq[4] ؓ demişdir: "Qəbirə azuqəsiz daxil olan kəs dənizə gəmisiz girən kimsəyə bənzəyir".

❁❁❁

---

[4] Əbu Bəkr əs-Siddiq: O, Abdullah ibn Əbu Quhafədir, Teyyim oğulları qəbiləsindəndir. Kişilərdən ilk iman gətirən şəxsdir. Öz qövmündə tutduğu vəzifədən imtina edərək haqq Peyğəmbərə tabe olmuşdur. Merac günü müşriklər bunu yalanlayaraq insanların qəlbinə şübhə atdıqları vaxt buna inandığına görə əs-Siddiq ləqəbini almışdır. O, mağarada Peyğəmbərlə birlikdə iki nəfərdən biri olmuş, Əsma ilə möminlərin anası Aişənin atası, Peyğəmbər ﷺ xəstələndikdə onu namazda əvəz edən idi. Səqifə günü Saidə oğulları qəbiləsinin çadırında ona beyət olunmuşdur. O, Peyğəmbərin ﷺ vəfatından sonra dindən çıxan mürtədlərə qarşı müharibə apararaq İslamı qorumuş, onlarla zəkat verənə qədər mübarizə aparmışdır. Peyğəmbərdən ﷺ sonra Cənnətlə müjdələnmiş on nəfərdən ilk vəfat edən şəxs o olmuşdur. Xilafət dövrü iki il üç ay sürmüş və hicrətin 13-cü ilində vəfat etmişdir.

Ömər[5] ﵁ demişdir: "Bu dünyada qüdrətli olmaq mal-dövlətlə, axirətdə izzətli olmaq isə saleh əməllərlə olur".

❁❁❁

Osman[6] ﵁ demişdir: "Dünyanın dərdini çəkmək qəlbdəki zülmətin, axirətin dərdini çəkmək isə qəlbdəki nurun olmasına dəlalət edir".

❁❁❁

Əli[7] ﵁ demişdir: "Elmi axtaran kimsəni Cənnət axta-

---

[5] Ömər ibn əl-Xəttab: O, Əbu Həfs, əl-Faruq, Udey oğulları qəbiləsindən idi. Uzun müddət Qureyş və digər qəbilələrlə birgə olmuş. İslamın izzətlənməsi üçün Peyğəmbərin ﷺ dua etdiyi iki Ömərdən biri idi. Ömər Səqifə gününün qəhrəmanı, Fars imperatorluğunun, Şamın, Fələstinin və Misirin fəthinin qalibi idi. Raşidi xəlifələrin ikincisi olan Ömər on il və bir neçə ay Xəlifə olmuşdur. Onun xilafəti dövründə İslam dini geniş yayılmışdı. O, deyilənə görə Hurmuzan və Kəbul əhbarla əlaqəsi olan Əbu Luluə adlı bir məcusi tərəfindən qətlə yetirilmişdir.

[6] Osman ibn Əffan: Raşidi xəlifələrin üçüncüsü olmuş, ramadə ilində və bir çox başqa İslam ordularını öz hesabına maliyyələşdirmişdi. O ardıcıl olaraq Peyğəmbərin ﷺ iki qızı ilə ailə həyatı qurmuşdu. Xilafəti dönəmində Liviya və Sudan fəth olunmuşdu. Riddə döyüşündə və ölkələrin fəthi zamanı bir çox hafizlərin şəhid olduğunu görərək Osman Quran toplanıb cəm olunmasına qərar vermişdi. Mülayim və yaşlı olduğu üçün onun yanına çox adam gəlib gedirdi. Xaricilər onun evini mühasirəyə almış və Onu Quran oxuyan zaman qətlə yetirmişdilər. Bu islamda ilk və ən ağrılı-acılı fitnə idi. Onun xilafəti on bir il və bir neçə ay davam etmişdi.

[7] Əli ibn Əbu Talib: Peyğəmbərin ﷺ əmisi oğlu və kürəkəni, iki nəvəsi Həsənlə Hüseynin atası idi. İslamı qəbul edən ilk yeniyetmə

rar, günah axtaranı isə Cəhənnəm odu axtarar".

❁❁❁

Yəhya ibn Muaz[8] demişdir: "Səxavətli adam Allaha asi olmaz, hikmətli şəxs də dünyanı axirətdən üstün tutmaz".

❁❁❁

Aməş[9] demişdir: "Təqvanı özünə əsas tutan kəsin dini barədə dillər çox danışar. Dünyanı özünə əsas tutan kəsin dininin zəifliyi barədə də dillər susmaz".

❁❁❁

---

idi. Hicrət günü Peyğəmbərin ﷺ yatağında yatmışdı. Mədinə şəhəri mühasirəyə alındıqda qureyşlilərin qəhrəmanı Amr ibn Vid əl-Amirini qətlə yetirmişdi. Peyğəmbərlə ﷺ birgə bütün döyüşlərdə iştirak etmişdi, yalnız Bədr döyüşündə Peyğəmbərin ﷺ ailəsini qorumaq üçün Mədinədə qalmışdı. O, Əbu Bəkrin, Ömərin və Osmanın müşaviri olmuşdur. Onlar Əli olmadan heç nəyə qərar verməzdilər. Osmandan sonra xəlifə olmuş, lakin Şamda Müaviyə ona beyət etməkdən imtina etmişdir. Sonra Cəməl və Siffeyn döyüşləri olmuş, habelə xavariclər də ona qarşı çıxmışdı. Sonda Hicrətin 40-cı ilində xavariclərdən biri onu qətlə yetirmişdi.

[8] Yəhya ibn Muaz (258 h) Əbu Zəkəriyyə, öz vaxtının ən görkəmli şəxslərindəndir. Əslən Rey əhlindən olan Yəhya Bəlx şəhərində bir müddət yaşamış, Nisapurda isə vəfat etmişdir. Bir çox hikmətli sözləri ilə məşhurdur. Onlardan biri belədir: "Kim Allaha gizlində xəyanət edərsə, Allah onun eybini aşkarda açar".

[9] Aməş (61–148h) Süleyman ibn Mihran əl-Əsədi, kunyəsi Əbu Muhəmməd Aməş, Aməş isə ləqəbidir. Bu məşhur tabiinin əsli Reydəndir, sonradan Kufədə yaşayıb orada da vəfat etmişdir. O, Quran, hədis və miras elmində alim idi. Təqribən 1300 hədis rəvayət etmişdir. Deyilənə görə Aməş hər bir hakimə və sultana öz məclisində ən əsası səviyyəli şəxs kimi baxardı. Baxmayaraq ki, o çox kasıb idi.

Süfyan əs-Sövri[10] demişdir: “Şəhvətlə bağlı olan hər bir asiliyin əfv olunmasına ümid var, təkəbbürlükdən olan hər hansı bir günahın bağışlanmasına ümid yoxdur. Belə ki, İblisin etdiyi günah təkəbbürlüklə, Adəmin etdiyi günah isə şəhvətlə bağlı idi”.

❋❋❋

Bəzi təqvalı şəxslər demişlər: “Kim gülə-gülə bir günah edərsə, Allah onu ağlaya-ağlaya Cəhənnəmə daxil edər. Habelə kim ağlayaraq Allaha itaət edərsə Allah onu gülərüzlə Cənnətə daxil edər”.

❋❋❋

Bəzi hikmətli şəxslər demişlər: “Kiçik günahlara həqarətlə baxmayın, çünki böyük günahlar onlardan əmələ gəlir”.

❋❋❋

Peyğəmbər ﷺ demişdir: “Davamiyyətli şəkildə edilən kiçik günah kiçik sayılmaz. Tövbə olunduqda böyük günah böyük olmaz”.

❋❋❋

---

[10] Süfyan əs-Sövri: (97–161h) Süfyan ibn Səid ibn Məsruq əs-Sövrinin kunyəsi Əbu Abdullahdır. Hədis elmində əmirəl möminin ləqəbini almışdır. Kufədə böyüyüb boya-başa çatmışdı. Xəlifə Mənsur onu qazı təyin etmək istəmiş, o isə bundan boyun qaçırmışdı. Xəlifə Mehdi isə onu axtardıqda ondan gizlənmişdi. Onun “Əl-Cəmi əl-Kəbir”, “əl-Cəmi əs-Sağir”, “əl-Fəraid” kimi kitabları var. İbn Cövzi onu fəzilətləri barəsində ayrıca bir kitab yazmışdır.

Bəzi müdrik şəxslər demişlər: “Kim Allahdan ona daha yaxın bir havadarının olduğunu düşünsə, Allahla bağlı bilgisi az olar. Eləcə də kim özündən daha böyük düşməninin olduğunu düşünsə özünü az tanımış sayılar”.

❁❁❁

Əbu Bəkr əs-Siddiq رضي الله عنه Uca Allahın: “Quruda və dənizdə fəsad zahir olmuşdur” ayəsi ilə bağlı belə demişdir: “Burada quruda deyildikdə dil, dəniz deyildikdə isə qəlb nəzərdə tutulur. Çünki dil xarab olduqda insanlar buna ağlayar, qəlb xarab olduqda buna mələklər ağlayar”.

❁❁❁

Demişlər ki: “Şəhvət, hökmdarları qula çevirər, səbir isə qulu hökmdar edər. Məgər Yusiflə عليه السلام Züleyxanın hekayəsini[11] oxumamısan?!”

❁❁❁

Belə demişlər ki: “Ağılı başçı, nəfsinin istəkləri isə əsir olan kəsə Cənnət olsun! Nəfsinin istəkləri hakim, ağılı isə əsir olan kəsin isə vay halına”.

❁❁❁

---

[11] Yusif və Züleyxanın hekayəsi: Yusif عليه السلام pak və məftunedici gözəlliyə malik bir peyğəmbər idi. Qardaşları onu quyuya atdıqdan sonra yoldan keçənlər onu çıxarıb Misirə aparaoften orada onu hökmdara satdılar. Hökmdarın xanımı isə Yusifə aşiq olaraq onunla yaxınlıq etmək istəmiş, Allah da Yusifi bu pislikdən qorumuşdu. Hökmdar Yusifi həbs etmişdi. Bir dəfə o, pis bir yuxu görmüş və onun yuxusunu heç kim yoza bilməmişdi. Bu zaman o, Yusifi yuxusunu yozmaq üçün yanına çağırmışdı.

Həmçinin demişlər: "Günahlardan yaxa qurtaran kəsin qəlbi incə olar. Haramdan əl çəkib halal yeyən kəsin düşüncə tərzi saf olar. Allah bəzi peyğəmbərlərinə belə vəhy etmişdir: "Sən əmr etdiyim şeylərdə Mənə itaət et, nəsihət etdiyim şeylərdə də Mənə asi olma".

❁❁❁

Həmçinin demişlər: "Ağılın kamilliyi Allahın razılığını qazanıb, Onun qəzəbinə səbəb olacaq əməllərdən uzaq olmaqdadır".

❁❁❁

Həmçinin demişlər: "Alim üçün qəriblik olmaz, cahilin isə vətəni olmaz".

❁❁❁

Həmçinin demişlər: "Kim Allaha çox itaət etməklə Ona yaxın olarsa, insanlar arasında qərib bir şəxs sayılar".

❁❁❁

Həmçinin demişlər: "İtaətin çox olması Allahla bağlı bilginin mövcudluğuna sübutdur. Necə ki, bədənin hərəkətdə olması onun diri olmasına sübutdur".

❁❁❁

Peyğəmbər ﷺ demişdir: "Bütün xətaların əsası dünya sevgisi, bütün fitnələrin əsası isə zəkatın verilməməsidir".

❁❁❁

Demişlər ki: “Öz təqsirlərini etiraf edən kəs həmişə təriflənər. Səhvləri etiraf etmək məqbulluğa sübutdur”.

❀❀❀

Həmçinin demişlər ki, nemətlərə naşükürlük etmək pis bir əməl, axmaq adamla dostluq etmək isə qəbahətdir”.

❀❀❀

# Üçlü bab

Peyğəmbər ﷺ demişdir: "Yaşayışının çətinliyindən şikayət edən şəxs Rəbbindən şikayət etmiş sayılar. Bu dünyanın çətinliklərinə görə kədərlənən kəs Allaha qarşı qəzəblənmiş sayılar. Habelə dövlətli bir kəsə var-dövlətinə görə ehtiram göstərənin dininin üçdə biri əldən gedər".

❁❁❁

Əbu Bəkr əs-Siddiq ﵁ demişdir: "Üç şey üç şeylə əldə olunmaz: Arzularla var-dövlət, saçı rəngləməklə cavanlıq və dava-dərmanla sağlamlıq".

❁❁❁

Ömər ﵁ demişdir: "İnsanlarla mülayim davranmaq ağlın yarısıdır, gözəl sual vermək elmin yarısıdır və yaxşı idarəetmə yaşayışın yarısıdır".

❁❁❁

Osman ﵁ demişdir: "Dünyanı tərk edəni Allah sevər; günahları tərk edəni mələklər sevər; müsəlmanların mülklərinə tamah salmayan kəsi müsəlmanlar sevər".

❁❁❁

Əli ﵁ demişdir: "Dünya həyatında olan nemətlərdən islam neməti sənə bəs edər, işlərin arasında itaət sənə bəs edər, ibrətlərin arasında isə sənə ölüm kifayət edər".

❁❁❁

Abdullah ibn Məsud[12] ﵁ demişdir: “Dünyada nemətlərin artmasına aldanan şəxslər təriflənməsindən qürurlanar və sirlərin insanlardan gizli qalmasını zənn edən kəslər nə qədər də çoxdur!”

❁❁❁

Davud peyğəmbər ﵇ demişdir: “Zəburda belə vəhy olunmuşdur: “Ağıllı şəxs yalnız üç şeyə nail olmaq üçün çalışar: Əbədi həyata hazırlıq, yaşamaq üçün zəruri olan gündəlik tələbatlar və halal olan ləzzətli nemətlər üçün”.

❁❁❁

Əbu Hüreyrə ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Üç şey xilas edən, üç şey həlak edən, üç şey dərəcələr və üç şey kəffarədir. Xilas edən üç şeyə gəldikdə həm gizlində, həm də aşkarda Uca Allahdan qorxmaq, həm kasıb, həm də zəngin olduqda lazımı qədər istifadə etmək və həm qəzəbli, həm də razı olduqda ədalətli olmaq. Həlak edənlər isə bunlardır: Çox paxıl olmaq, nəfsin istəklərinə tabe olmaq və insanın özünü bəyənməsi. Dərəcələr bunlardır: Salamı yaymaq, acları yedirtmək və insanlar yatmış halda olduqları zaman gecə vaxtı namaz qılmaq. Kəffarə-

---

[12] Abdulla ibn Məsud (32h) Ğafil ibn Həfif əl-Huzəli böyük səhabələrdəndir. İslamı ilk qəbul edənlərdəndir. Məkkədə ilk dəfə yüksək səslə Quran oxuyan o olmuşdur. Osmanın xilafəti dövründə Mədinəyə gəlmiş və iki il sonra orada dünyasını dəyişmişdir. O həddən ziyada alçaq boylu və ətiri çox sevən idi. Əl-Cahizin “Əl-Bəyan və ət-Tədbir” əsərində onun çoxlu xütbə və məqalələri vardır.

lər isə bunlardır: Soyuq vaxtlarda dəstəmaz almaq, camaat namazlarına getmək və namazdan sonra digər namazı gözləmək”.

❁❁❁

Cəbrayıl عليه السلام demişdir: “Ey Muhəmməd, nə qədər yaşayırsan yaşa, bil ki, öləcəksən. Kimi sevirsən sev, bil ki, ayrılacaqsan. Nə istəyirsən et, bil ki onun əvəzini alacaqsan”.

❁❁❁

Peyğəmbər ﷺ demişdir: “Üç nəfərə Allah heç bir kölgə olmadığı bir zamanda ərşin kölgəsində yer verəcəkdir. Çətin vaxtlarda dəstəmaz alana, zülmət qaranlıqlarda məscidlərə gedənə və acları doydurana”.

❁❁❁

İbrahimdən عليه السلام soruşmuşlar: “Allah sənin hansı xüsusiyyətlərinə görə səni Özünə dost seçib?” O demişdir: “Üç şeyə görə: Allahın əmrini başqalarının əmrindən üstün tutmamışam, Allahın mənə vəd etdiyi şeylərə görə heç vaxt narahatçılıq keçirməmişəm və bütün nahar və şam yeməklərini qonaqlarla birgə yemişəm”.

❁❁❁

Bəzi müdrik şəxslər deyiblər ki, üç şey insanı qəmqüssədən uzaqlaşdırır: Allahı zikr etmək, Onun övliyaları ilə görüşmək və hikmət sahiblərinin kəlamlarını oxumaq.

❁❁❁

Həsən əl-Bəsri[13] demişdir: "Əxlaqı olmayanın elmi də olmaz, səbri olmayanın dini də olmaz, təqvası olmayanın Allaha yaxınlığı da olmaz".

❁❁❁

Rəvayət olunur ki, İsrail övladlarından bir nəfər elm tələb etmək üçün evdən çıxmış, onun xəbəri gedib peyğəmbərinə çatdıqda onu yanına çağırıb demişdir: "Cavan oğlan, sənə əvvəlkilərin və sonrakıların elmini özündə birləşdirən üç xüsusiyyəti nəsihət edəcəyəm: həm gizlində, həm də aşkarda Allahdan qorx, dilini saxla və insanlara xeyir söylə, bir də yediyin yeməyə diqqət yetir ki, halal olsun". Bunu eşitdikdə həmin gənc səfərə çıxmaq fikrindən vaz keçmişdi.

❁❁❁

Rəvayət olunur ki, İsrail övladlarından bir nəfər səksən sandıq kitab toplamış, lakin onlardan faydalanmamışdır. Uca Allah həmin qövmün peyğəmbərlərinə vəhy etmişdir ki, nə qədər kitab yığsan da bil ki, bu üç şeyi bilmək sənə yetər. Dünyanı sevmə, çünki ora möminlərin diyarı deyil, şeytanla dostluq etmə, çünki o möminlərin dostu deyil, bir də ki heç kimə əziyyət vermə, çünki bu möminlərə xas əlamət deyil.

❁❁❁

---

[13] Həsən əl-Bəsri: O, Bəsrədə yaşamış məşhur mühəddis alim idi. Mötəzili əqidəsinin banisi Vasil ibn Ətaya müəllimlik etmişdi. O ərəb dili, fiqh və Kəlam elmində Bəsrənin şeyxi idi.

Əbu Süleyman əd-Dərani[14] dua edərək demişdir: "Ey Allahım, məndən günahımı soruşsan məni əfv etməyini istəyəcəyəm. Paxıllığım barədə soruşsan Sənin səxavətini istəyəcəyəm. Əgər məni Cəhənnəm oduna atsan, oradakılara Səni sevdiyimi xəbər verəcəyəm".

❁❁❁

Deyirlər ki, ən xoşbəxt adam, elmli qəlbi, habelə səbirli bədəni olan, üstəlik aza qane olandır.

❁❁❁

İbrahim ən-Nəxəi[15] demişdir: "Sizdən əvvəlkiləri üç şey həlak etmişdir: çox danışmaq, çox yemək və çox yatmaq".

❁❁❁

Yəhya ibn Müaz ər-Razi demişdir: "Sağ ikən dünyanı tərk edən kəsə, ölməmişdən əvvəl qəbrini düzəldən kəsə və Rəbbi ilə görüşməmişdən əvvəl Onu razı salan kimsəyə Cənnət olsun".

❁❁❁

Əli ﵁ demişdir: "Allahın, Onun peyğəmbərinin və övliyalarının yolunu getməyənin heç nəyi olmaz". Soruşdular:

---

[14] Süleyman əd-Dərani (215h) Əbdür-Rəhman ibn Əhməd ibn Atiyyə əl-Ənsi, Dəməşq şəhərinin Ğufa ərazisində Dərayyə kəndində məşhur zahiddir. O, elm almaq üçün Bağdada getmiş, sonra Dəməşqə qayıdaraq orada vəfat etmişdir.

[15] İbrahim ən-Nəxai (71h) İbrahim ibn əl-Əştər ən-Nəxai Musab ibn Zubeyrin dostlarından olan şücaətli bir sərkərdə idi. Məskində qətlə yetirilmiş, Samirə şəhərində isə dəfn olunmuşdur. Şücaətli olması ilə yanaşı çox təqvalı bir şəxs idi.

“Allahın yolu nədir?” Dedi: “Sirri gizlətmək”. Soruşdular: “Peyğəmbərin yolu nədir?” Dedi: “İnsanlarla nəzakətlə davranmaq”. Soruşdular: “Bəs övliyaların yolu nədir?” Dedi: “İnsanların əziyyətlərinə dözmək”. Bizdən əvvəlkilər üç şeyi nəsihət edərək yazardılar: “Kim axirəti üçün çalışsa, Allah onun dini və dünyası üçün yetər. Kimin gizlindəki halı yaxşı olarsa, aşkarını da Allah yaxşı edər və kim Allahla arasını düzəldərsə, Allah da onunla insanların arasını düzəldər.

❃❃❃

Əli رضي الله عنه həmçinin demişdir: “Allah yanında ən yaxşı, nəfsinin yanında isə ən pis insan ol. İnsanlar arasında isə onlardan biri kimi ol”.

❃❃❃

Deyirlər ki, Uca Allah Üzeyrə عليه السلام belə vəhy etmişdir: “Ey Üzeyr, günah iş gördükdə, həmin günahın kiçikliyini deyil, kimə asi olduğunu düşün. Habelə sənə kiçicik bir xeyir nəsib olduqda, onun kiçikliyini deyil, sənə o ruzini verənin kim olduğunu düşün. Sənə bir bəla üz verdikdə insanlara şikayət etmə ki, Mən də sənin əməllərindən mələklərə şikayət etməyim”.

❃❃❃

Hatim əl-Əsam demişdir: “Hər səhər şeytan məndən soruşur: “Nə yeyirsən? Nə geyinirsən? Harada yaşayırsan?” Mən də ona belə cavab verirəm: “Ölümü yeyir, kəfən geyinir və qəbirdə yaşayıram”.

❃❃❃

Peyğəmbər ﷺ demişdir: “Kim günahların kölgəsindən çıxıb itaətin izzətinə sığınarsa Uca Allah onu mal-dövlətsiz varlandırar. Ona ordusuz yardım edər və onu qohum-əqrəbasız izzətləndirər”.

❁❁❁

Rəvayət olunur ki, bir dəfə Peyğəmbər ﷺ səhabələrindən soruşdu: “Səhəri necə qarşıladınız?” Onlar dedilər: “Allaha iman gətirərək qarşıladıq”. O dedi: “İmanınızın əlaməti nədir?” Onlar dedilər: “Bəlalara səbir edir, rahatlığa şükür edir və qədərə razılığımızı bildiririk”. Peyğəmbər ﷺ dedi: “Kəbənin Rəbbinə and olsun ki, siz həqiqi möminsiniz”.

❁❁❁

Allah bəzi peyğəmbərlərinə belə vəhy etmişdir: “Məni sevərək Mənə qovuşanı Cənnətimə daxil edərəm, Məndən qorxaraq Mənə qovuşanı Cəhənnəm odundan uzaqlaşdıraram. Məndən utanaraq Mənə qovuşanın günahlarını mələklərə unutduraram”.

❁❁❁

Abdullah ibn Məsud رضي الله عنه demişdir: “Allahın sənə fərz etdiyinə əməl et, ən çox ibadət edən insan sayılarsan. Allahın haram buyurduqlarından çəkin ən zahid insan olarsan və Allahın sənə ayırdığı ilə razılaş insanların ən varlısı olarsan”.

❁❁❁

Saleh əl-Mirqədi bir dəfə bir diyardan keçərkən dedi: “Hanı sənin əhalin? Hanı səni inşa edənlər? Hanı səndə sakin olanlar?” Bu zaman bir səs gəldi: “Onların izi-tozu

kəsilib, cəsədləri torpağın altında çürüyüb və yalnız əməlləri onlarla birlikdə qalıb”.

❁❁❁

Əli ﵁ demişdir: “İstədiyin şəxsə hədiyyə ver onun ağası olarsan, kimdənsə nə isə istəsən onun əsiri olarsan. Kiməsə nə isə verib-almasan onun kimi olarsan”.

❁❁❁

Yəhya ibn Müaz demişdir: “Dünyanı bütünlükdə tərk etmək, onu bütünlükdə əldə etmək deməkdir. Onu bütünlükdə tərk edən onu tam əldə etmiş, tam əldə edən isə bütövlükdə tərk etmiş olar. Beləliklə onu əldə etmək tərk etməklə, tərk etmək isə əldə etməklə olur”.

❁❁❁

İbrahim əl-Ədhəmdən soruşdular: “Zahidliyə nə ilə nail olmusan?” Dedi: “Üç şeylə: qəbri çox dəhşətli gördüm, mənim isə heç bir sakitləşdirənim yoxdur, yolu çox uzun gördüm, mənim isə yetərincə azuqəm yoxdur, Allahın Hakim olduğunu gördüm, mənim isə özümü müdafiə etməyə əsasım yoxdur”.

❁❁❁

Əş-Şibli demişdir: “Allahım, qazandığım bütün savabları, onlara ehtiyacım olduğu halda Sənə bəxş edirəm. Ey Sahibim! Mənə ehtiyacın olmadığı halda günahlarımı necə əfv etməyəsən?”

❁❁❁

Həmçinin demişdir: “Əgər Allahdan razı qalmaq istəyirsənsə, öz nəfsinə qarşı ikrah hissi keçir”.

❁❁❁

Həmçinin demişdir: “Əlaqə qurmağın şirinliyini dadmış olsaydınız, ayrılığın acılığına da bələd olardınız”.

❁❁❁

Bir dəfə Süfyan əs-Sövridən: “Allaha sevinmək nə deməkdir?”- deyə soruşulduqda o demişdir: “Bu o deməkdir ki, gərək sən gözəl simalı üzün, gözəl səsin və fəsahətli dilin vurğunu olmayasan”.

❁❁❁

İbn Abbas[16] رضي الله عنهما demişdir: “Zuhd (zahidlik) sözü üç hərfdən ibarətdir: zəy, hə və dəl. Zəy hərfi – əbədi həyata tədarük, hə hərfi dində hidayət və nəhayət dəl hərfi davamiyyətli şəkildə itaət anlamına gəlir”.

❁❁❁

Həmçinin demişdir: “Zəy hərfi – zinətin tərk olunması, hə hərfi – nəfsin istəklərini tərk etmək, dəl isə dünyanı tərk etmək mənasındadır”.

❁❁❁

Hamid əl-Lifəf rəvayət edir ki, bir nəfər onun yanına gəlib: “Mənə nəsihət ver”- dedi. O da ona: “Quran kitabının üzü olduğu kimi sən də öz dininə üz çək”- dedi. Adam so-

---

[16] Abdullah ibn Abbas böyük səhabə və möhtəşəm bir alim idi. Peyğəmbərdən ﷺ elm almış və ondan 1660 hədis rəvayət etmişdir.

ruşdu: “Dinə necə üz çəkmək olar ki?” Dedi: “Tələb olunandan artıq danışmamaq, tələb olunandan artıq dünyanı tərk etmək və tələb olunandan artıq insanlarla ünsiyyətdə olmağı tərk etməklə. Sonra da bil ki, zahidliyin əsası hər növ haramlardan uzaqlaşmaq, böyüklü-kiçikli bütün vacibləri yerinə yetirmək və dünyanı bütövlükdə tərk etməkdir”.

❁❁❁

Loğman əl-Həkimdən rəvayət olunur ki, bir dəfə o oğluna müraciət edib deyir: “Ey oğlum insan üç qismdən ibarətdir: birinci qismi Allaha, ikinci qismi özü üçün, üçüncü qismi isə qurdlar üçündür. Allah üçün olan qismə gəlincə o insanın ruhu, özü üçün olan öz əməlləri, qurdlar üçün olan isə bədənidir”.

❁❁❁

Əli ﷺ demişdir: “Üç şey hafizəni gücləndirir və bəlğəmi yox edir: misvak, oruc tutmaq və Quran oxumaq”.

❁❁❁

Kəbul Əhbar demişdir: “Möminin üç qalası var: Məscid, Allahı zikr etmək və Quran oxumaq”.

❁❁❁

Bəzi müdrik şəxslər demişlər: “Üç şey Allahın xəzinəsindəndir və Allah onları yalnız sevdiyi kəslərə bəxş edər: kasıblıq, xəstəlik və səbir”.

❁❁❁

Rəvayət edilir ki, ibn Abbasdan ﷺ soruşdular: “Ən xeyirli gün, ən xeyirli ay və ən yaxşı əməl hansıdır?” O dedi:

“Ən xeyirli gün cümə günü, ən xeyirli ay Ramazan ayı və ən yaxşı əməl vaxtında qılınan beş vaxt namazdır”. Üç gün sonra xəbər gedib Əliyə çatdıqda o dedi: “Əgər yer üzərindəki bütün alimlərə bu sual verilsəydi ibn Abbasın verdiyi cavabı verə bilməzdi. Mənim fikrimcə isə ən xeyirli əməl Uca Allahın səndən qəbul etdiyi əməl, ən xeyirli ay səmimi qəlbdən tövbə etdiyin ay və nəhayət, ən xeyirli gün isə dünyadan Allaha iman gətirmiş halda olaraq çıxdığın gündür”.

❁❁❁

Şair demişdir:

Gecə ilə gündüzün növbələşməsi biz şənlənərkən bəlli deyilmi,

Dünyaya bel bağlama sən əsl həyat dünyada deyil.

Ölümündən qabaq çalış dostların çoxluğuna aldanma.

❁❁❁

Demişlər ki: “Allah bir quluna xeyir istədikdə onu dində elmli, dünyada zahid və öz eyiblərini görən edər”.

❁❁❁

Peyğəmbər ﷺ demişdir: “Dünyamızdan mənə üç şey sevdirildi: ətir, qadınlar və gözümün nuru olan namaz”. Bunu eşitdikdə Əbu Bəkr dedi: “Doğru buyurursan, ey Allahın Rəsulu, dünyadan mənə də üç şey sevdirilib: Allahın rəsulunun üzünə baxmaq, mal-dövlətimi Allahın rəsuluna xərcləməyim və qızımın Allahın rəsulunda ərdə olması”. Bunu eşidəndə Ömər dedi: “Doğru deyirsən, ey Əbu Bəkr, mənə də bu dünyadan üç şey sevdirilib: yaxşı işlərə dəvət etmək, pis işlərdən çəkindirmək və nimdaş paltar

geyinmək". Sonra Osman dedi: "Doğrudur, ey Ömər, mənə də dünyadan üç şey sevdirilib: acları doydurmaq, ehtiyacı olanları geyindirmək və Quran oxumaq". Sonra isə Əli dedi: "Düz deyirsən, ey Osman, mənə də dünyada üç şey sevdirilib: qonağa xidmət etmək, yay vaxtı oruc tutmaq və qılınc çalmaq".

❁❁❁

Onlar bu halda ikən Cəbrayıl عليه السلام enib dedi: "Uca və Ulu Allah əmr edir ki, məndən əgər dünya əhlindən olsaydım nəyi sevərdin, deyə soruşsan". O dedi: "Əgər dünya əhlindən olsaydın nəyi sevərdin?" Cəbrayıl عليه السلام cavab verir: "azanlara yol göstərmək, qürbətdə yaşayan kəslərə yardım etmək və çətin vəziyyətdə yaşayanların ailəsinə yardım etmək". Sonra Cəbrayıl عليه السلام dedi: "Rəbbimiz isə qullarından üç xüsusiyyəti sevir: bacardığı şeyi əsirgəməməyi, peşman olduqda ağlamağı və ehtiyac içində olduqda səbir etməyi".

❁❁❁

Bəzi hikmətli şəxslər demişlər: "Öz ağlını hər şeydən üstün tutan yolunu azar, mal-dövləti hesabına varlanmaq istəyən ehtiyac içində olar və məxluqun vasitəsilə izzətlənmək istəyən zəlil olar".

❁❁❁

Həmçinin demişlər: "Allahı tanımaq üç şeyin sayəsində olar: Uca Allahdan utanmaq, Allah üçün sevmək və Allah üçün razı qalmaq".

❁❁❁

Peyğəmbər ﷺ demişdir: “Tanımağın əsası sevgi, yəqinliyin əlaməti iffətli olmaq, habelə yəqinliyin başında təqva və Allahın qədərindən razılıq durur”.

❁❁❁

Süfyan ibn Uyeynə demişdir: “Allahı sevən Onun sevdiyi kəsləri də sevər. Onun sevdiyi kəsləri sevən Allah üçün sevənləri də sevər. Onun üçün sevənləri sevən isə insanların onu tanımamasını istər”.

❁❁❁

Peyğəmbər ﷺ demişdir: “Səmimi məhəbbət üç şeydən bilinir: sevdiyinin sözünü başqasının sözündən üstün tutmaqla, sevdiyinin yanında olmağı başqalarının yanında olmaqdan üstün tutmaqla və sevdiyi şəxsin razılığını başqalarının razılığından üstün tutmaqla”.

❁❁❁

Vahb ibn Munəbbih əl-Yəməni demişdir: “Tövratda yazılıb ki, həris olan kəs dünyaya ağalıq etsə belə yenə də kasıbdır. İtaət edən isə qul olsa belə ona itaət olunar və qənaətcil şəxs ac olsa belə yenə varlı sayılar”.

❁❁❁

Bəzi müdriklər demişlər: “Allahını tanıyan məxluqatdan ləzzət almaz, dünyanın mahiyyətini dərk edən ona rəğbət bəsləməz və Allahın ədalətini dərk edənin üzərinə Allah rəqiblər göndərməz”.

❁❁❁

Yunus ﷺ demişdir: “Qorxaq qaçar, istəyən axtarar və Allahla dostluq edən isə nəfsindən uzaq olar”.

❁❁❁

Həmçinin demişdir: “Allahı tanıyan Onun qulu olar, onun qəlbi (haqqı) görər, əməlləri isə çox olar”.

❁❁❁

İbn Süleyman əd-Dərani demişdir: “Dünyada və axirətdə hər bir xeyrin əsası Allah qorxusudur, dünyanın açarı toxluq, axirətin açarı isə aclıqdır”.

❁❁❁

Demişlər ki: “İbadət məşğuliyyətdir, bu məşğuliyyətin yeri xəlvətdə olmaqdır. Sərmayəsi təqva, qazancı isə Cənnətdir”.

❁❁❁

Malik ibn Dinar demişdir: “Üç şeylə üç cür rəftar et ki, möminlərdən olasan: təkəbbürlüyə təvazökarlıqla, hərisliyə qənaətlə və həsədə isə nəsihətlə”.

❁❁❁

# Dördlü bab

Peyğəmbər ﷺ Əbu Zər əl-Ğifariyə demişdir: “Ey Əbu Zər gəmini təzələ, çünki dəniz dərindir, azuqəni də yetərincə et, çünki səfərin uzağadır, yükünü də azalt, çünki maneə keçilməzdir, əməllərini də ixlasla et, çünki onların əvəzini verən görür”.

❁❁❁

Şair demişdir:
İnsanların tövbə etməsi fərzdir
Günahları tərk etməksə daha vacib,
Çətin anda səbir etmək çətindir
Savabı itirmək isə daha çətin,
Vaxtın keçməsi çox qəribədir
İnsanların qəflətdə olması daha qəribə,
Gələ biləcək hər şey yaxındadır
Ölüm isə onlardan daha yaxın.

❁❁❁

Bəzi müdrik şəxslər demişlər: “Dörd şey yaxşıdır, dörd şey isə onlardan da yaxşıdır: Kişinin həyalı olması yaxşıdır, qadının həyalı olması isə daha yaxşıdır. Hər kəsin ədalətli olması yaxşıdır, hökmdarların ədalətli olması isə daha yaxşıdır. Yaşlı adamın tövbə etməsi yaxşıdır, cavanın tövbəsi isə daha yaxşıdır. Zəngin adamın əliaçıqlığı yaxşıdır, kasıbın əliaçıqlığı isə lap yaxşıdır”.

❁❁❁

Bəzi hikmət sahibləri demişlər: “Dörd şey pisdir, dörd şey isə onlardan da pisdir: Cavan adamın günah etməsi pisdir, yaşlının günah etməsi isə daha pisdir. Cahilin dünyaya bel bağlaması pisdir, alimin bu əməli etməsi isə daha pisdir. Bütün insanların itaətə tənbəllik etmələri pisdir, alimlərin və tələbələrin isə bunu etmələri daha pisdir. Varlı şəxslərin təkəbbürlük etməsi pisdir, kasıbların isə bunu etmələri daha pisdir”.

❁❁❁

Peyğəmbər ﷺ demişdir: “Səma əhli üçün planetlər əmanətdir, onlar dağılsa məsuliyyəti səma əhli çəkəcək. Mənim əhli beytim də ümmətimə əmanətdir, əhli beytim getsə məsuliyyət ümmətimin üzərinə düşəcək. Mən də səhabələrimə bir əmanətəm, mən getsəm məsuliyyət səhabələrimin üzərinə düşəcək. Dağlar isə yerin sakinlərinə əmanətdir. Onlar getsə məsuliyyət yerdəkilərin üzərinə düşər”.

❁❁❁

Əbu Bəkr əs-Siddiq رضي الله عنه demişdir: “Dörd şeyin tamamı dörd şeylə olur: namazın tamamı iki səhv səcdəsi ilə, orucun tamamı fitrə zəkatı ilə, həccin tamamı fidyə ilə, imanın tamamı isə cihadla olur”.

❁❁❁

Abdullah ibn Mübarək demişdir: “Gün ərzində on iki rükət (nafilə) namazı qılan şəxs namazın haqqını vermiş olar. Ay ərzində üç gün oruc tutan şəxs orucun haqqını vermiş olar. Gün ərzində yüz ayə oxuyan şəxs qiraətin

haqqını vermiş olar. Həftə ərzində bir dirhəm sədəqə verən şəxs sədəqənin haqqını vermiş olar”.

❁❁❁

Ömər رضي الله عنه demişdir: “Dörd növ dəniz vardır: günahların dənizi nəfsin istəkləri, nəfs şəhvətlərin dənizi, ölüm ömürlərin dənizidir və qəbir peşmançılıqların dənizidir”.

❁❁❁

Osman رضي الله عنه demişdir: “İbadətin şirinliyini dörd şeydə tapmışam: Allahın fərzlərini yerinə yetirməkdə, Allahın haram buyurduqlarından uzaqlaşmaqda, Allahın savabını diləyərək yaxşı işlərə dəvət etməkdə və Allahın qəzəbindən qorxaraq pis işlərdən çəkinməkdə”.

❁❁❁

Həmçinin demişdir: “Dörd şey var ki, onlar həm zahirən, həm də batinən fərz sayılır: Əməlisaleh şəxslərlə oturub-durmaq fərzdir, onlara qoşulmaq da, Quranı oxumaq fərzdir, ona əməl etmək də, qəbirləri ziyarət etmək fərzdir, ora tədarük görmək də, xəstələri ziyarət etmək fərzdir, onlardan tövsiyə almaq da”.

❁❁❁

Əli رضي الله عنه demişdir: “Cənnəti istəyən yaxşı işlərə tələsməli, Cəhənnəmdən qurtulmaq istəyən isə şəhvətlərdən uzaqlaşmalıdır. Ölümün həqiqətini anlayan heç bir şeydən ləzzət almaz, dünyanın gerçəyini dərk edənə bəlalar yüngül gələr”.

❁❁❁

Peyğəmbər ﷺ demişdir: “Namaz dinin dirəyidir, susmaq isə daha xeyirlidir. Sədəqə Rəbbin qəzəbini söndürür, susmaq isə daha əfzəldir. Oruc tutmaq Cəhənnəm oduna qarşı bir sipərdir, susmaq isə daha xeyirlidir. Cihad dinin zirvəsidir, susmaq isə daha əfzəldir”.

❁❁❁

Deyilənə görə Uca Allah İsrail oğullarına göndərilmiş peyğəmbərlərdən birinə vəhy edərək demişdir: “Pis şeylər danışmayıb susmaq Mənim üçün orucdur, əzalarını haramlardan qorumağın Mənim üçün namazdır, insanlardan əlini üzməyin Mənim üçün sədəqədir, müsəlmanlara əziyyət verməməyin Mənim üçün cihaddır”.

❁❁❁

Abdullah İbn Məsud رضي الله عنه demişdir: “Dörd şey qəlbin zülmət içərisində olmasını göstərir: halal və ya haram olmasına varmadan dolu olan mədə, zalımlarla dostluq etmək, keçmiş günahları unutmaq və uzun-uzadı arzulara, xəyallara dalmaq”.

❁❁❁

Dörd şey isə qəlbin nuruna dəlildir: “Haramdan ehtiyat edərək ac qalan mədə, əməlisaleh şəxslərlə dostluq etmək, keçmiş günahları vaxtaşırı xatırlamaq və az-az xəyallara dalmaq”.

❁❁❁

Hatim əl-Əsam demişdir: “Dörd şey olmadan dörd şeyi iddia edənin iddiası yalandır: haramlardan çəkinmə-

dən Allahı sevdiyini iddia edənin iddiası yalandır; kasıb-kusubu xoşlamayıb Peyğəmbəri ﷺ sevdiyini iddia edənin iddiası yalandır, sədəqə vermədən Cənnəti istədiyini iddia edənin iddiası batildir, günahlardan əl çəkmədən Cəhənnəm odundan qorxduğunu iddia edənin iddiası yalandır".

❁❁❁

Peyğəmbər ﷺ demişdir: "Dörd şey bədbəxtliyin əlamətləridir: Allah yanında qorunmasına rəğmən günahların unudulması, qəbul olunub olunmadığını bilmədən keçmişdə edilən savab işlərin xatırlanması, dünyəvi işlərdə özündən yuxarıdakılara, dini məsələlərdə isə özündən aşağıda olanlara baxmaq. Uca Allah buyurur: "Mən onu istədim, o isə Məni istəmədi, Mən də onu tərk etdim". Səadətin də dörd əlaməti var: keçmiş günahları xatırlamaq, keçmişdə edilən savab işləri unutmaq, dində özündən daha üstün olana baxmaq, dünya işlərində isə özündən aşağı səviyyədə olanlara baxmaq".

❁❁❁

Bəzi müdrik şəxslər demişlər: "İmanın dörd şüarı var: Təqva, həyalı olmaq, şükr etmək və səbir etmək".

❁❁❁

Peyğəmbər ﷺ demişdir: "Analar dörd cürdür: dərmanların anası, əxlaqların anası, ibadətlərin anası və əmin-amanlığın anası. Dərmanların anası az yemək, əxlaqların anası az danışmaq, ibadətlərin anası az günah etmək, əmin-amanlığın anası isə səbirdir".

❁❁❁

Həmçinin ﷺ demişdir: “İnsan bədənində olan dörd cövhəri dörd şey aparır: Dörd cövhər ağıl, din, həya və saleh əməldir. Qəzəb ağılı aparır, həsəd dini aparır, tamahkarlıq həyanı aparır və qeybət etmək saleh əməlləri aparır”.

❁❁❁

Peyğəmbər ﷺ demişdir: “Cənnətdə dörd şey var ki, Cənnətin özündən daha xeyirlidir: Cənnətdə əbədi qalmaq Cənnətin özündən daha xeyirlidir, Cənnətdə mələklərin insana xidmət etməsi Cənnətin özündən daha xeyirlidir, Cənnətdə peyğəmbərlərə qonşu olmaq Cənnətin özündən daha xeyirlidir, Cənnətdə Allahın razılığına nail olmaq Cənnətin özündən daha xeyirlidir. Həmçinin Cəhənnəmdə olacaq dörd şey Cəhənnəmin özündən daha pisdir: Cəhənnəmdə əbədi qalmaq Cəhənnəmin özündən daha pisdir, mələklərin Cəhənnəmdə insanları qınamaları Cəhənnəmin özündən daha pisdir, Cəhənnəmdə şeytana qonşu olmaq Cəhənnəmin özündən daha pisdir və nəhayət Cəhənnəmdə Allahın qəzəbinə düçar olmaq Cəhənnəmin özündən daha pisdir”.

❁❁❁

Bir müdrik şəxsdən: “Necəsən?” - deyə soruşduqda o belə cavab vermişdi: “Rəbbimə müvafiqəm, nəfsimə isə müxalif, insanlara nəsihət edirəm, dünyadan da ehtiyacım olan qədər istifadə edirəm”.

❁❁❁

Bəzi hikmət sahibləri dörd müqəddəs kitabın hərəsindən bir ifadə seçmişlər: Tövratdan: “Allahın ayırdığı payla

qane olan həm bu dünyada, həm də axirətdə rahat olar". İncildən: "Şəhvətlərinə qalib gələn həm bu dünyada, həm də axirətdə izzətlənər". Zəburdan: "İnsanlardan uzaq olan həm bu dünyada, həm də axirətdə nicata çatar". Furqandan: "Dilini qoruyan kəs həm bu dünyada, həm də axirətdə nicata çatar".

❁❁❁

Ömər ﵁ demişdir: "Mən hər dəfə bir bəlaya düçar olduqda Allah mənə dörd nemət bəxş edir: bəla günahlarımdan dolayı başıma gəlir, bəla etdiyim günahlardan böyük olmur, bəlaları səmimi qəbul edirəm və bəlalara görə savab diləyirəm".

❁❁❁

Abdullah ibn Mübarək demişdir: "Bir nəfər çoxlu hədislər toplamış, sonra onların arasından qırx min hədis seçmişdi, sonra onların arasından dörd min hədis seçmiş, sonra onların arasında dörd yüz hədis seçmiş, daha sonra onların arasından qırx hədis seçmişdi. Nəhayət, onların arasından dörd hədis seçmişdi: heç bir vəchlə qadına etibar etmə; heç vaxt mal-dövlətlə qürurlanma; tələb olunandan artıq mədəni doldurma; faydasız elmə yiyələnmə".

❁❁❁

Muhəmməd ibn Əhməd demişdir: "Uca Allah Yəhyanı qul olmasına rəğmən cənab adlandırmışdı. O, buna dörd düşmənə qalib gəldiyi üçün nail ola bilmişdi: nəfsin istəklərinə, iblisə, dilinə və qəzəbinə".

❁❁❁

Əli رضي الله عنه demişdir: “Dörd şey mövcud olduğu müddətdə dinlə dünya da mövcud olacaqdır: Varlılar əllərindəkinə paxıllıq etməyəcəkləri, alimlər yiyələndikləri elmə əməl edəcəkləri, cahillər bilmədikləri şeylərlə təkəbbürlük etməyəcəkləri və kasıblar axirətlərini dünyalarına qurban verməyəcəyi müddətdə”.

❁❁❁

Peyğəmbər ﷺ demişdir: “Uca Allah Qiyamət günü dörd şəxsi dörd qrup insana ibrət edəcəkdir: Varlılara Süleyman ibn Davudu, kölələrə Yusufu, xəstələrə Əyyubu və kasıblara İsanı”.

❁❁❁

Səd ibn Bilal demişdir: “İnsan günah iş gördüyündə Uca Allah onu dörd şeyə malik edir: Ruzisi bol olur, sağlam olur, günahı nəzərə çarpmır və o tez cəzalandırılmır”.

❁❁❁

Hatim əl-Əsam demişdir: “Dörd şeyi dörd yerə saxlayan Cənnətlik olar: yuxunu qəbirə, lovğalanmağı mizan tərəzisinə, rahatlığı sirat körpüsünə, şəhvəti isə Cənnətə saxla”.

❁❁❁

Hamid əl-Lifaf demişdir: “Dörd şeyi dörd yolla axtardıq başqa dörd yerdə tapdıq: varlanmağı mal-dövlətdə axtardıq, qənaətdə tapdıq, rahatlığı sərvətdə axtardıq, mal-dövlətin azlığında tapdıq, ləzzəti nemətlərdə aradıq sağlam bədəndə tapdıq və ruzini yerdə axtardıq göydə tapdıq”.

❁❁❁

Əli ﷛ demişdir: "Dörd şeyin azı da çoxdur: üzüntü, kasıblıq, od və düşmənçilik".

❁❁❁

Hatim əl-Əsam demişdir: "Dörd şeyin qədrini yalnız dörd nəfər bilər: cavanlığın qədrini qocalar bilər, əmin-amanlığın qədrini yalnız başlarına müsibət gələnlər bilər, sağlamlığın qədrini yalnız xəstələr bilər, həyatın qədrini yalnız ölülər bilər".

❁❁❁

Şair Əbu Navus demişdir:
Günahlarım barədə çox düşünsəm də
Rəbbimin mərhəməti günahlarımdan böyükdür.
Öz yaxşı əməllərimə arxayın deyiləm
Yalnız Allahın rəhmətinə ümidim qalıb.
Sahibim olan Allah məni yaradıb
Mən də etiraf edim ki Onun quluyam.
Əgər məni bağışlasa bu mərhəmətdir
Əgər belə olmasa mən nə edərəm?

❁❁❁

Peyğəmbər ﷺ demişdir: "Qiyamət günü gəldikdə mizan tərəzəsi qoyular, namaz qılanların mükafatları tərəzi ilə verilər, oruc tutanların da mükafatları tərəzi ilə verilər. Sonra həcc edənlər gələr və onların da mükafatları tərəzi ilə verilər. Daha sonra başlarına bəla gələnlərin növbəsi çatar və onlara nə tərəzi qoyular nə də haqq-hesab edilərlər. Beləcə onlar

mükafatlarını alıb gedərlər. Bunu görən sağlam insanlar təmənna edəcəklər ki, kaş ki bizim də onun kimi çoxlu savabımız olaydı".

❁❁❁

Bəzi hikmət sahibləri demişlər: "Adəm övladına dörd növ itki üz verir: Ölüm mələyi onun ruhunu, varislər mal-dövlətini, qurdlar cəsədini və haqqını tapdaladığı şəxslər Qiyamət günü savablarını talayır".

❁❁❁

Həmçinin demişlər: "Şəhvətləri ilə məşğul olanın gərək qadınları olsun, mal-dövlət toplamaqla məşğul olan harama da varmalıdır, müsəlmanlara fayda verməklə məşğul olan onların arasında gəzib-dolaşmalıdır və ibadətlə məşğul olanın gərək elmi də olsun".

❁❁❁

Əli ﵁ demişdir: "Əməllərin ən çətini dörddür: qəzəblənəndə bağışlamaq, çətin durumda ola-ola yaxşılıq etmək, xəlvətdə iffətli olmaq, haqq sözü eşitmək istəyənə haqqı söyləmək".

❁❁❁

Zəburda deyilir ki, Uca Allah Davuda ﵇ belə vəhy etmişdir: "Ağıl və hikmət sahibi olan kəs vaxtını dörd qismə bölür: bir qismini Rəbbindən kömək diləmək üçün, bir qismini özünü haqq-hesaba çəkmək üçün, bir qismini öz

eyiblərini özünə göstərən qardaşlarının yanına getmək üçün və bir qismini halal nemətlərdən həzz almaq üçün.

❁❁❁

Bəzi müdrik şəxslər demişlər: “Bütün ibadətlərin əsası dörddür: əhdlərə vəfa etmək, dinin sərhədlərini aşmamaq, itirilən nemətə səbir etmək və olana razı qalmaq”.

❁❁❁

# Beşli bab

Peyğəmbər ﷺ demişdir: “Beş şeyə aşağı gözlə baxan kəs beş şeyi itirər: alimlərə aşağı gözlə baxan kəs dinini itirər, hakimlərə aşağı gözlə baxan dünyasını itirər, qonşulara aşağı gözlə baxan çoxlu mənfəət itirər, qüvvətli şəxslərə aşağı gözlə baxan mərhəmətini itirər və ailəsinə aşağı gözlə baxan xoş güzəranı itirər”.

❁❁❁

Peyğəmbər ﷺ demişdir: “Bir vaxt gələcək, ümmətim beş şeyi sevəcək, beş şeyi isə unudacaq: vaxt gələcək onlar dünyanı sevib axirəti unudacaq, evləri sevib qəbirləri unudacaq, mal-dövləti sevib haqq-hesabı unudacaq, əhli-əyalı sevib haqqı sevməyi unudacaq, özlərini sevib Allahı unudacaqlar. Beləcə onlar məndən, mən isə onlardan uzaq olacağam”.

❁❁❁

Peyğəmbər ﷺ demişdir: “Allah birinə beş şey əta etdikdə, digər beş şeyi də ona verir: şükür verdikdə əlavəsini də verir, duanı verdikdə ona cavab da verir, istiğfarı verdikdə bağışlanmanı da verir, tövbəni verdikdə əfvi də verir, sədəqəni verdikdə onun qəbul olmasını da verir”.

❁❁❁

Əbu Bəkr əs-Siddiq رضي الله عنه demişdir: “Zülmətlər və çıraqlar beş cür olur: dünyanı sevmək zülmət, təqva isə çıraqdır, günah etmək zülmət, tövbə etmək isə çıraqdır, qəbir zülmət, oranın çırağı isə “lə iləhə illəllah Muhəmmədən

rəsulullah"dır, axirət zülmət, oranın çırağı isə saleh əməldir, sirat körpüsü zülmət yəqinlik isə onun çırağıdır".

❁❁❁

Ömər ﵁ demişdir: "Əgər qeybə əl atmaq qorxusu olmasaydı beş cür insanın Cənnətlik olduğuna şahidlik edərdim: külfət sahibi olan kasıba, ərinin razılığını qazanan qadına, mehrini əri üçün xərcləyən qadına, valideynlərinin razılığını qazanana və günahlarından tövbə edənə".

❁❁❁

Osman ﵁ demişdir: "Müttəqilərin əlamətləri beşdir: müttəqi olanın yalnız dini möhkəm olar və dili ilə övrət yerinə qalib gələn şəxslərlə yoldaşlıq edər, müttəqi olanın başına böyük bir iş gəldikdə onu kiçik sayar, dini üçün bir şey etmək fürsətini isə əsla fövtə verməz, müttəqi olan kəs içərisində haramın da olmasından qorxaraq halalla qarnını doldurmur və o hamını uğur qazanmış, özünü isə həlak olmuş görür".

❁❁❁

Əli ﵁ demişdir: "Beş xüsusiyyət olmasaydı bütün insanlar əməli-saleh hesab olunardılar: cahilliklə qənaətlənmək, dünyaya həris olmaq, paxıllıq etmək, əməldə riyakarlıq etmək və özünü bəyənmək".

❁❁❁

Bəzi alimlər demişlər: "Uca Allah Muhəmməd Peyğəmbərə ﷺ beş növ kəramət bəxş etmişdir: Allah ona ad, bədən, vergi, günahlarının bağışlanması və razılıq vermiş-

dir. Allah Təalə Öz Kitabında başqa peyğəmbərlərdən fərqli olaraq Muhəmmədi ﷺ: "Ey Peyğəmbər" – deyə çağırmışdır. Halbuki Adəmi, Nuhu, İbrahimi və başqalarını yalnız adları ilə çağırırdı, başqa peyğəmbərlərdən fərqli olaraq Peyğəmbər ﷺ bir dua etdikdə onun duasını bir başa Özü cavablandırardı, vergini isə Peyğəmbər ﷺ Allahdan istəmədən ona vermişdi, günahların əfv edilməsini isə əvvəlcədən "Allah səni bağışlamışdır"- deyə buyurmuşdur, razılığa gəldikdə isə Allah onun nə fidyəsini, nə də sədəqəsini geri qaytarmışdır. Başqa peyğəmbərlər isə belə deyil".

❁❁❁

Abdullah ibn Amr ibn As رضي الله عنهما demişdir: "Beş şeyi deyən kimsə həm bu dünyada, həm də axirətdə xoşbəxt olar:

– vaxtaşırı "lə iləhə illəllah, Muhəmmədən rəsulullah" deyən;

– başına bir müsibət gəldikdə: "Biz Allahınıq, Allaha da dönəcəyik, Uca və Əzəmətli olan Allahdan başqa güc və qüdrət sahibi yoxdur" deyən;

– Nemət əldə etdikdə şükr edərək: "Əlhəmdulillahi Rəbbil aləmin" deyən;

– bir şeyə başladıqda: "Bismillahir-Rəhmanir Rəhim" deyən;

– günah bir iş gördükdə: "Əzəmətli Allahdan bağışlanma diləyərək Ona tövbə edirəm" deyən.

❁❁❁

Həsən əl-Bəsri demişdir: "Tövratda beş şey yazılmışdır: varlanma qənaətlə olur, salamatlıq təkliklə olur, şəhvətlər-

dən üz çevirməklə Allah yanında hörmətə nail olmaq olur, səbir etmək dünyada gərəkdir, axirətdə".

❁❁❁

Peyğəmbər ﷺ demişdir: "Beş şey gəlməmişdən öncə beş şeyin qədrini bil: qocalıq gəlməmişdən qabaq cavanlığının, xəstəlik gəlməmişdən sağlamlığının, kasıblıq gəlməmişdən var-dövlətinin, ölüm gəlməmişdən həyatının və məşğul olmamışdan qabaq asudə vaxtının qədrini bil".

❁❁❁

Yəhya ibn Müaz ər-Razi demişdir: "Çox yeyənin əti çoxalar, əti çox olanın şəhvəti çox olar, şəhvəti çox olanın günahları da çox olar, günahları çox olanın qəlbi sərt olar, qəlbi sərt olan isə dünya naz-nemətləri içərisində boğular".

❁❁❁

Süfyan əs-Sövri demişdir: "Kasıblar beş şey, varlılar da beş şey seçiblər: kasıblar rahatlığı, qəlbin boşluğunu, Allaha ibadət etməyi, haqq-hesabın azlığını və uca mərtəbələri seçiblər, varlılar isə özünü yormağı, qəlbi məşğul etməyi, dünyaya ibadət etməyi, haqq-hesabı çətinləşdirməyi və alçaq dərəcələri".

❁❁❁

Abdullah əl-Əntaki demişdir: "Qəlbin beş dərmanı var: əməlisaleh şəxslərlə oturub-durmaq, Quran oxumaq, mədəni boş tutmaq, gecələri ibadətdə keçirmək və sübh çağında Allaha yalvarmaq".

❁❁❁

Alimlər demişlər: “Düşüncələr beş cür olur:

– Allahın möcüzələri haqqında olan düşüncələr, bundan tövhid və yəqinlik əmələ gəlir;

– Allahın nemətləri haqqında olan düşüncələr, bundan da sevgi əmələ gəlir;

– Uca Allahın vədi haqqında olan düşüncə, bu da rəğbət bəsləməyə səbəb olur;

– Allahın əzabı haqqında düşüncə, bu isə qorxuya səbəb olur;

– Allahın verdiyi nemətlərə rəğmən itaətdə nöqsanlara yol verməк, bu da utanmağa səbəb olur”.

❁❁❁

Bəzi müdrik adamlar demişlər: “Beş mərhələni adlayan təqvaya nail olar:

– çətinliyi nemətdən üstün tutmaq;
– çalışmağı rahatlıqdan üstün tutmaq;
– zəlilliyi izzətlənməkdən üstün tutmaq;
– susmağı danışmaqdan üstün tutmaq;
– ölümü yaşamaqdan üstün tutmaq”.

❁❁❁

Peyğəmbər ﷺ demişdir: “Allaha yalvarmaq sirləri əlçatmaz edir, sədəqə mal-dövləti qoruyur, ixlas əməlləri qoruyur, düzgünlük sözləri qoruyur, məsləhətləşmək isə rəyləri qoruyur”.

❁❁❁

Peyğəmbər ﷺ demişdir: “Mal-dövlət toplamağın beş xüsusiyyəti var: toplamağın əziyyəti, Uca Allahı zikr et-

məkdən yayınmaq, onun oğurlanmasından qorxu, paxıl adına layiq olmaq ehtimalı və mal-dövlətə görə əməlisaleh kəslərdən uzaqlaşmaq. Mal-dövləti tərk etməyin də beş xüsusiyyəti var: rahatlıq, Allahı zikr etmək imkanı, oğrulardan qorxmamaq, səxavətli adını qazanmaq ehtimalı və əməlisalehlərlə dostluq etmək".

❋❋❋

Süfyan əs-Sövri demişdir: "İndiki zamanda yalnız beş xüsusiyyətə malik şəxslər varlana bilərlər: Uzun ömürlü olmağa ümidli olmaq, güclü hərislik, güclü paxıllıq, təqvanın azlığı və axirəti unutmaq".

❋❋❋

Şair demişdir:
Ey dünya üçün çalışan kəs,
Bil ki, dünyanın hər gün bir dostu var.
Özünə ər axtarırsan halbuki,
Başqa yerdə ona əvəz tapırsan.
Sülh ərlərinizə yaxınlaşmadı
Yalnız onların məhvinə qaldı.
Bununla qürurlanıram lakin bəla
Yavaş-yavaş bədənimə işləyir.
Carçı əbədi çağırmadan qabaq,
Ölüm üçün lazımı tədarük görün.

❋❋❋

Hatim əl-Əsam demişdir: "Tələsmək şeytandandır, yalnız beş yerdə tələsmək rəsulullahın ﷺ sünnətindəndir: qonaq gəldikdə onu yedirtmək, cənazəni dəfn üçün hazır-

lamaq, qız həddi buluğa çatdıqda onu ərə vermək, borcu qaytarmaq və günahdan tövbə etmək".

❁❁❁

Muhəmməd ibn əd-Duri demişdir: "İblis beş şeyin səbəbindən bədbəxt olmuşdur: günahını etiraf etmədi, peşman olmadı, tövbə etmədi, Allahın rəhmətindən ümidini üzdü və özünü danlamadı".

❁❁❁

Adəm isə beş şeyin sayəsində xoşbəxt oldu: günahını etiraf etdi, peşman oldu, özünü danladı, tövbə etməyə tələsdi, Allahın rəhmətindən ümidini üzmədi".

❁❁❁

Şəqiq əl-Bəlxi demişdir: "Beş xüsusiyyətə əməl etməyə çalışın: Allaha ehtiyacınız olduğu qədər ibadət edin, dünyadan yaşayacağınız müddət qədər götürün, Allahın əzabına tab gətirə biləcəyiniz qədər günah edin, qəbirdə olacağınız qədər dünyada azuqə toplayın, Cənnətdə əldə etmək istədiyiniz məqam qədər yaxşı əməllər edin".

❁❁❁

Ömər ﵁ demişdir: "Bütün dostlara nəzər saldım, dili saxlamaqdan daha yaxşı dost görmədim. Bütün libaslara nəzər saldım, təqvadan daha yaxşı libas görə bilmədim. Hər növ var-dövlətə nəzər saldım, qənaətdən daha yaxşı var-dövlət görə bilmədim. Yaxşı əməllərə nəzər saldım, nəsihətdən yaxşısını görə bilmədim. Hər növ təamlara nəzər saldım, səbirdən daha ləzzətli təama rast gəlmədim".

❁❁❁

Bəzi hikmətli şəxslər demişlər: "Zahidlik beş əlamətlə olur: Allaha inam, məxluqlardan uzaqlaşmaq, əməldə ixlas, zülmə dözmək və əldə olanla qənaətlənmək".

❁❁❁

Bəzi abidlər dua edərək demişlər: "Allahım, çoxlu arzularım məni aldatdı, dünya sevgisi məni həlak etdi, şeytan məni azdırdı, pis işlərə əmr edən nəfsim məni haqdan uzaqlaşdırdı və pis yoldaşlar məni günahlar etməyə vadar etdi, ey yardım istəyənlərə yardım edən mənə də kömək et, əgər Sən mənə yardım etməsən kim edər?!"

❁❁❁

Peyğəmbər ﷺ demişdir: "Bir vaxt gələcək mənim ümmətim beş şeyi sevib beş şeyi unudacaqdır: Onlar dünyanı sevib axirəti unudacaq, həyatı sevib ölümü unudacaq, qəsrləri sevib qəbirləri unudacaq, mal-dövləti sevib haqq-hesabı unudacaq, məxluqu sevib Xaliqi unudacaqlar".

❁❁❁

Yəhya ibn Müaz ər-Razi dua edərək demişdir: "Allahım, Sənə yalvarmadan gecəm sakit olmaz, Sənə itaət etmədən gündüzüm yaxşı olmaz, Səni xatırlamadan dünyam yaxşı olmaz, Sənin əfvin olmadan axirətim yaxşı olmaz, Səni görmədən Cənnət rahat olmaz".

❁❁❁

# Altılı bab

Peyğəmbər ﷺ demişdir: “Altı şey var ki, altı yerdə qərib sayılır: məscid namaz qılmayan qövmün arasında qərib sayılır; Quran oxumayan kəslərin mənzilində Quran qərib sayılır; fasiq bir kimsənin köksündə Quran qərib sayılar; əməlisaleh və müsəlman qadın pis əxlaqlı zalım bir ərin yanında qərib sayılar, habelə əməlisaleh və müsəlman bir kişi pis və əxlaqsız qadının yanında qərib sayılar”. Sonra peyğəmbər ﷺ buyurdu: “Bu şəxslərə Allah Qiyamət günü mərhəmət gözü ilə baxmaz”.

❁❁❁

Peyğəmbər ﷺ demişdir: “Altı cür adamı həm Uca Allah, həm mən, həm də bütün peyğəmbərlər lənətləmişdir: Allahın Kitabına əlavələr edənləri, Allahın qədərini yalan sayanları, Allahın izzətləndirdiyi kəsi alçaltmaq istəyənləri, zəlil etdiyi kəsi isə ucaltmaq üçün həddini aşıb hökmranlıq edənləri, Allahın haram buyurduğunu halal sayanları, əhli-beytimə qarşı Allahın haram buyurduğunu halal sayanlar, sünnətimi tərk edənlər, Uca Allah bunlara mərhəmət gözü ilə baxmaz”.

❁❁❁

Əbu Bəkr ؓ demişdir: “Ey insan, İblis sənin önündə, nəfsin sağında, istəklərin solunda, dünya arxanda, bədən üzvlərin sənin ətrafında, yenilməz qüvvət sahibi isə fövqündədir. Allahın lənətinə gəlmiş İblis səni dinini tərk etməyə, nəfsin səni günah işlər görməyə, istəklərin səni şəhvətlərə,

dünya onu axirətdən üstün tutmağına, bədən üzvlərin səni günahlara, yenilməz qüvvət Sahibi isə səni Cənnətə və bağışlanmağa səsləyir. Uca Allah buyurur: "Allah isə Cənnətə və bağışlanmağa çağırır". İblisin dəvətinə icabət edənin dini, nəfsə tabe olanın ruhu, nəfsin istəklərinə cavab verənin ağlı, dünyaya cavab verənin axirəti, bədən üzvlərinin tələblərinə cavab verən cənnəti itirmiş olar. Allahın çağırışını qəbul edənin isə günahları silinər və o hər cür xeyirə nail olar".

❁❁❁

Ömər ﵁ demişdir: "Uca Allah altı şeyi altı şeydə gizlətmişdir: Allah razılığı itaətdə, qəzəbi günahda, ən uca Adını Quranda, qədr gecəsini Ramazanda, orta namazı namazların arasında, Qiyamət gününü isə gündüzlərin arasında gizlətmişdir".

❁❁❁

Osman ﵁ demişdir: "Mömin olan kəs altı şeydən qorxsun:

– qorxsun ki, Allah onun imanını əlindən alsın;

– qorxsun ki, mələklər Qiyamət günü onu rüsvay edə biləcək bir əməl qeyd etmiş olsunlar;

– qorxsun ki, şeytan onun əməllərini batil etsin;

– qorxsun ki, qəflətdə olarkən ölüm mələyi onun canını alsın;

– qorxsun ki, dünyaya başı qarışsın və axirəti unutsun;

– qorxsun ki, əhli-əyalı onu Allahı zikr etməkdən yayındırsın".

❁❁❁

Əli ﷺ demişdir: "Altı cəhəti özündə birləşdirən şəxs Cənnətə nail olmuş və Cəhənnəmdən yaxa qurtarmış olar: Allahı tanıyıb Ona itaət edən, şeytanı tanıyıb ona qarşı çıxan, axirəti tanıyıb onun üçün çalışan, dünyanı tanıyıb ondan üz çevirən, haqqı bilib ona tabe olan və batili tanıyıb ondan üz çevirən".

❁❁❁

Həmçinin demişdir: "Altı növ nemət var: İslam, Quran, Allahın rəsulu Muhəmməd, sağlamlıq, insanlardan uzaq olmaq və heç kimin əlinə göz dikməmək".

❁❁❁

Yəhya ibn Müaz ər-Razi demişdir: "Əməlin sübutu elmdir, elmin əsası isə düzgün anlamaqdır, ağıl xeyir göstəricisidir, nəfsin istəkləri günahların miniyidir, mal-dövlət təkəbbürlü şəxslərin geyimidir, dünya isə axirətin bazarıdır".

❁❁❁

Əbu Zər demişdir: "Altı xüsusiyyət bütün dünyaya dəyər: dadlı təam, əməlisaleh övlad, sözəbaxan həyat yoldaşı, hikmətli kəlam, ağılın kamilliyi və bədənin sağlamlığı".

❁❁❁

Həsən əl-Bəsri demişdir: "Əgər əməlisaleh şəxslər olmasaydı yer üzərindəki hər bir şey batıb gedərdi. Əməlisalehlər olmasaydı günahkarlar həlak olardı. Alimlər olmasaydı bütün insanlar heyvan kimi olardılar, başçı olma-

saydı insanların hamısı bir-birini qırardılar, axmaqlar olmasaydı dünya məhv olardı və külək olmasaydı hər şey xarab olardı”.

❁❁❁

Bəzi hikmət sahibləri demişlər: “Allahdan qorxmayan kəs dilinin bəlasından yaxa qurtara bilməz, Allahla görüşəcəyindən qorxmayan şəxsin qəlbi haramdan və şübhədən qurtulmaz. İnsanlardan uzaq olmayan kəs tamahkarlıqdan da qurtulmaz. Əməllərini mühafizə etməyən kəs riyakarlıqdan yaxa qurtara bilməz. Qəlbinin islah olunmasını Allahdan diləməyən kəs həsəddən qurtulmaz və özündən daha çox elmi və əməli olan kəslərə nəzər salmayan özünü bəyənməkdən yaxa qurtara bilməz”.

❁❁❁

Həsən əl-Bəsri demişdir: “Qəlbi altı şey xarab edir: tövbə edəcəyinə arxayın olaraq günah etmək, elmi öyrənib ona əməl etməmək, əməli ixlasla etməmək, Allahın ruzisini yeyib şükür etməmək, Allahın böldüyü ruzi ilə razı qalmamaq və ölüləri dəfn edib ibrət almamaq”.

❁❁❁

Həmçinin demişdir: “Kim dünyanı axirətdən üstün tutarsa Allah ona altı növ cəza verər, həmin cəzalardan üçü dünyada, üçü isə axirətdə olar. Dünyadakı üç cəza bunlardır: sonsuz arzulara dalmaq, üstün gələn hərislik və qənaətsizlik, üstəlik bu cür şəxsdən ibadətin ləzzəti götürülər. Axirətdə olacaq üç cəza növü isə bunlardır: Qiyamət

gününün qorxulu halları, güclü haqq-hesab və uzun-uzadı həsrət çəkmək”.

❁❁❁

Əhnəf ibn Qeys demişdir: “Həsəd aparan kəs rahatlıq tapmaz, yalançının mənliyi olmaz, paxılın hiyləsi olmaz, hökmdarların vəfası olmaz, əxlaqı pis olanın hörməti olmaz, Allahın qədərini isə dəyişdirmək olmaz”.

❁❁❁

Bəzi müdriklərdən soruşdular ki: “İnsan tövbə etdikdə tövbənin qəbul olunub olunmadığından agah ola bilərmi?” O dedi: “Buna hökm verə bilmərəm, lakin onun əlamətləri var:

– özünü günahlardan qorunmamış hesab etməsi;

– qəlbində sevincin qeyb olunmasını, kədərin isə mövcudluğunu hiss etməsi;

– xeyirxah şəxslərin yaxınlığını, şər əhlinin isə uzaqda olmasını hiss etməsi;

– dünyanın azını çox, axirət üçün edilən əməllərin çoxunu isə az görməsi;

– fikrinin Allaha ibadətdə olmasında və dünya nemətlərinə məşğul olmaması;

– dilini qorumuş və peşmançılıq hissi keçirərək daim fikirli olması”.

❁❁❁

Yəhya ibn Müaz demişdir: “Zənnimcə ən böyük özünü aldatma peşman olmadan bağışlanmaya arxayın olaraq

günahları davam etdirmək, itaət etmədən Allaha yaxın olmağı hesab etmək, Cəhənnəmin toxumları ilə Cənnət bağlarında əkin əkməyi gizlətmək, asiliklə itaətkarlara məxsus məqamları diləmək, əməl etmədən mükafat gözləmək, ifrata varacaq dərəcədə Allahdan təmənna etmək".

❈❈❈

Əhməd ibn Qeysdən bir dəfə soruşdular ki: "İnsana bəxş olunmuş ən xeyirli nemət nədir?" O dedi: "Anadangəlmə ağıl". Soruşdular: "Başqa nə?" Dedi: "Ədəb-ərkan". Soruşdular: "Daha nə?" Dedi: "Yaxşı dost". Soruşdular: "Başqa nə?" Dedi: "Susmaq". Soruşdular: "Daha nə?" Dedi: "Qəfil ölüm".

❈❈❈

# Yeddili bab

Peyğəmbər ﷺ demişdir: “Qiyamət günü Uca Allah yeddi qisim insanı ərşin kölgəsində kölgələndirəcəkdir və həmin gün onun kölgəsindən savayı heç bir kölgə olmayacaqdır: ədalətli hökmdar, Allaha ibadət etməklə boya-başa çatan gənc, Allahı təklikdə xatırlayan və Allah qorxusundan gözləri dolan kəs, qəlbləri məscidlərə bağlı olan kəs, sol əlinin sağ əlin nə qədər sədəqə verdiyini bilməyəcək qədər gizli sədəqə verən kimsə, Allah üçün bir-birini sevən kəs və gözəl bir qadın yaxınlıq etməyə dəvət etdikdə: “Mən Allahdan qorxuram” - deyərək ondan üz döndərən kişi”.

❁❁❁

Əbu Bəkr əs-Siddiq ﵁ demişdir: “Xəsisin aqibəti yeddi cür olur: Ya o öldükdən sonra onun topladığı mal-dövlət Allah üçün deyil başqa şeylərə sərf olunur, ya Allah ona elə bir zalım hökmdar müsəllət edir ki, onun özünü alçaldıb malını əlindən alır, ya şəhvətlərinə uyub malını məhv edir, ya qeyri münasib bir yerdən bir imarət tikdirir və malını hədər verir, ya dünya fəlakətlərindən biri oğurluq, yanğın və ya suda batmaq onun başına gəlir, ya çarəsi tapılmaz bir xəstəliyə düçar olur və mal-dövlətini onun müalicəsinə sərf edir və ya onu bir yerdə basdırıb yerini unudur”.

❁❁❁

Ömər ﵁ demişdir: “Çox gülənin üzündəki heybət azalar, insanları lağa qoyanı lağa qoyarlar, bir şeyi çox

edən onunla tanınar, çox danışanın səhvi çox olar, səhvi çox olanın həyası az olar, həyası az olanın təqvası azalar və təqvası azalanın qəlbi ölər”.

❁❁❁

Osman رضي الله عنه Uca Allahın: “Onun altında xəzinə vardı və onların valideynləri də əməlisaleh şəxslər idi” ayəsi haqqında demişdir: “Həmin xəzinə üzərində yeddi sətir söz yazılmış qızıl bir lövhə idi, həmin sözlər bunlardır: ölümün baş verəcəyini bilərək gülən adama təəccüb edirəm, dünya həyatının müvəqqəti olduğunu bilərək onun üçün çalışan adama təəccüblənirəm, hər şeyin qədərlə bağlı olduğunu bilərək nəyinsə itməsinə kədər keçirən şəxsə təəccüblənirəm, hesabın olacağını bilərək mal-dövlət toplayan şəxsə təəccüblənirəm, Cəhənnəm odunun mövcudluğunu bilərək günah işlər görən şəxsə təəccüb edirəm, Allahı yəqinliklə tanıyaraq başqasını xatırlayan şəxsə təəccüb edirəm, Cənnəti yəqinliklə tanıyaraq dünyada istirahət edən şəxsə təəccüb edirəm, habelə şeytanın düşmən olduğunu bilərək ona itaət edən şəxsə təəccüb edirəm”.

❁❁❁

Əlidən رضي الله عنه soruşdular: “Səmadan daha ağır, yerdən daha geniş, dənizdən daha zəngin, daşdan daha sərt, Cəhənnəmdən daha isti, Cəhənnəm soyuğu Zəmhərirdən daha soyuq və zəhərdən daha acı nə var?” O dedi: “Günahsız kəsləri ittiham etmək səmadan daha ağır, haqq yerdən daha geniş, qənaətcil qəlb dənizdən daha zəngin, ikiüzlü qəlb daşdan daha sərt, zülmkar hökmdar Cəhənnəm

odundan daha isti, alçaq insanlara möhtac olmaq Cəhənnəmdəki Zəmhəririn soyuğundan daha soyuq, səbir zəhərdən də acıdır (və ya söz gəzdirmək zəhərdən də acıdır)”.

❁❁❁

Peyğəmbər ﷺ demişdir: “Dünya, evi olmayanın evi, malı olmyanın malıdır, ağlı olmayan kəslər onu yığar, anlamayanlar onun şəhvətlərinə qurşanar, elmi olmayanlar ona görə cəzalandırılar, ağlı olmayanlar ona görə həsəd aparar və yəqinliyi olmayanlar ona səy göstərərlər”.

❁❁❁

Cabir ibn Abdullah əl-Ənsari رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Cəbrayıl qonşu haqqında mənə o qədər nəsihət etdi ki, onun varis olacağını belə düşündüm, qadınlar haqqında o qədər nəsihət etdi ki, onları boşamağın haram olacağını düşündüm, kölələr barəsində mənə o qədər nəsihət etdi ki, onların nə vaxtsa azad olacaqlarını düşündüm, misvak barəsində o qədər nəsihət etdi ki, onun fərz olduğunu düşündüm, camaat namazı barəsində o qədər nəsihət etdi ki, camaat olmadan namazın qəbul olunmadığını düşündüm, gecə namazı barəsində o qədər nəsihət etdi ki, gecə vaxtı yatmağın qadağan olduğunu düşündüm, habelə Allahı zikr etmək barədə o qədər nəsihət verdi ki, zikrdən savayı hər bir sözün faydasız olduğunu düşündüm”.

❁❁❁

Həmçinin demişdir: "Yeddi qism insana Qiyamət günü Allah nəzər salmaz, onları təriﬂəməz və onları Cəhənnəmə daxil edər: Lut qövmünün etdiyini edən və edilən, istimna edən, heyvanlarla yaxınlıq edən, qadınla arxadan yaxınlıq edən, qadınla qızını birlikdə alan, qonşusunun qadını ilə zina edən, qonşusunu lənət edən dərəcəyə çatdıraraq ona əziyyət verən".

❁❁❁

Peyğəmbər ﷺ demişdir: "Allah yolunda öləndən başqa şəhidlər yeddi növdür: qarınağrıdan ölən, suda boğulan, ağ ciyər iltihabından ölən, vəbadan ölən, yanğından ölən, dağıntı altında qalaraq ölən və doğuşdan ölən qadın şəhiddir".

❁❁❁

İbn Abbas رضي الله عنهما rəvayət edir ki, ağıllı olan kəs gərək yeddi şeyi yeddi şeydən ayırıb üstün tutsun: kasıblığı varlılıqdan, zəlilliyi varlılıqdan, təvazökarlığı təkəbbürlükdən, aclığı toxluqdan, kədəri sevincdən, aşağılığı yuxarılıqdan və ölümü həyatdan.

❁❁❁

# Səkkizli bab

Peyğəmbər ﷺ demişdir: “Səkkiz şey səkkiz şeydən doymaz: göz baxmaqdan, yer yağmurdan, qadın kişidən, alim elmdən, çox sual verən sualdan, ac-göz olan yığmaqdan, dəniz sudan və ocaq odundan”.

❁❁❁

Əbu Bəkr əs-Siddiq ؓ demişdir: “İffətli olmaq kasıblığın zinəti, şükür nemətin zinəti, səbir bəlanın zinəti, düzgün anlamaq elmin zinəti, təvazökarlıq elm tələb edənin zinəti, çox ağlamaq qorxunun zinəti, minnət etməyi tərk etmək yaxşılığın zinəti və xuşu namazın zinətidir”.

❁❁❁

Ömər ؓ demişdir: “Çox danışmağı tərk edənə hikmət bəxş olunar, çox baxmağı tərk edənə qəlb qorxusu verilər, çox yeməyi tərk edənə ibadətdən həzz almaq nəsib olar, çox gülməyi tərk edənə heybətlilik verilər, zarafatı tərk edənə gözəllik verilər, dünya sevgisini tərk edənə axirət sevgisi bəxş olunar, başqalarının səhvlərini araşdırmaqdan uzaq olana öz ayıblarını tapmaq nəsib olar, Allahın necəliyini araşdırmaqdan uzaq olan kəs nifaqdan yaxa qurtarmış olar”.

❁❁❁

Osman ؓ demişdir: “Arif adamların səkkiz əlaməti var: qəlbi qorxu və rica ilə dolu olur, dili həmdi-səna ilə, gözləri həyalı və yaş olur, istəyi tərk etmək və Rəbbinin razılığını qazanmaq olur”.

❁❁❁

Əli رضي الله عنه demişdir: “Xuşu ilə qılınmayan namazda xeyir olmaz, pis sözlərdən uzaqlaşmadan tutulan orucda xeyir olmaz, aramla oxunmayan qiraətdə xeyir olmaz, qorxu olmadan əldə olunan elmdə fayda olmaz, səxavət olmadan mal-dövlətdə xeyir olmaz, qorunub saxlanmadan olan qardaşlıqda xeyir olmaz, davamiyyətli olmayan nemətdə xeyir olmaz, ixlas olmayan duada xeyir olmaz”.

❁❁❁

# Doqquzlu bab

Peyğəmbər ﷺ demişdir: "Uca Allah Musa ibn İmrana Tövratda vəhy etmişdir ki, günahların əsasları üçdür: təkəbbürlük, həsəd və hərislik. Bu üç günahdan da daha altı günah əmələ gəlir və doqquz olur: doymaq, yatmaq, rahatlıq, mal-dövlət sevgisi, təriflənməyi sevmək və başçı olmağı sevmək".

❁❁❁

Əbu Bəkr əs-Siddiq ؓ demişdir: "Abidlər üç sinfə bölünür, hər sinfin də özünəməxsus üç əlaməti vardır: birinci sinif Allahdan qorxaraq Ona ibadət edir, ikinci sinif Allahdan diləyərək Ona ibadət edir, üçüncü sinif isə Allahı sevərək Ona ibadət edir. Birinci sinfin əlamətləri bunlardır: özünü kiçik, savablarını az, günahlarını isə çox görür. İkinci sinfin də üç əlaməti var: bütün vəziyyətlərdə insanlara nümunə olur, dünyada mal-dövlətin paylanmasında ən səxavətli şəxs olur və Allahın yaratdıqlarına qarşı həmişə yaxşı zəndə olur. Üçüncü sinfin də üç əlaməti var: sevdiyi şeyi başqasına verir, Allahı razı saldıqdan sonra heç nədən narahat olmur, Rəbbini razı salan əməllər edərək nəfsini qəzəbləndirir, hər bir işində halalları edərək və haramlardan çəkinməklə Rəbbindən razı olur".

❁❁❁

Ömər ؓ demişdir: "Şeytanın doqquz övladı[17] var: Zəleytun, Vasin, Laqos, Əvan, Həffaf, Murra, Musavvit, Də-

---

[17] Bu rəvayətin sənədini tapa bilməmişik, yalnız Əbu Həfsdən nəql olunur.

sim, Valəhəm. Zəleytun bazarlarda işləyir və barmağını oraya sancır. Vasin müsibətlərin sahibidir, Əvan hökmdarların sahibidir, Həffaf isə içkilərin sahibidir, Murra musiqi alətlərinin sahibidir, Laqos məcusilərin dostudur, əl-Musavvit heç bir əsasa istinad etməyən sözləri insanların dilinə salmaqla məşğuldur, Dəsim evlərin sahibidir, biri evinə girdikdə salam verməzsə və Allahın adını çəkməzsə, onların ailəsinə boşanma və dava-dalaşa gətirib çıxarar, mübahisə salar. Valəhəm isə dəstəmaz, namaz və ibadətlərdə insanlara vəsvəsə verməklə məşğul olur".

❁❁❁

Osman ﷺ demişdir: "Beş vaxt namazı vaxtlı-vaxtında qılaraq onları mühafizə edən şəxsə Uca Allah kəramət nəsib edər: Allah onu sevər, bədəni sağlam olar, mələklər onu qoruyar, evinə bərəkət nazil olar, üzündə əməlisalehlik olar, Allah onun qəlbini yumşaldar, Sirat körpüsündən ildırım sürəti ilə keçər, Allah onu oddan xilas edər və Allah heç bir qorxusu və ürküsü olmayan kəslərə qonşu edər".

❁❁❁

Əli ﷺ demişdir: "Üç cür ağlamaq olur. Birinci: Allahın əzabından qorxaraq, ikinci qəzəbə düçar olmaqdan qorxaraq və üçüncü ayrılıqdan qorxaraq. Birinciyə gəlincə günahların kəffarəsidir, ikinci eyiblərin təmizlənməsidir, üçüncü isə sevilənin razılığını qazanaraq Ona yaxın ol-

maq. Günahların kəffarə olunmasının səmərəsi əzablardan yaxa qurtarmaq, eyiblərin təmizlənməsinin səmərəsi davamlı nemətlərə və yüksək dərəcələrə nail olmaq, sevilənin razılığını qazanaraq Ona yaxın olmanın səmərəsi Yaradanı görməklə, mələklərin ziyarəti və fəzilətin çoxalması ilə razı qalmaqdır”.

❁❁❁

# Onlu bab

Rəsulullah ﷺ demişdir: "Misvakdan istifadə edin, onun on xüsusiyyəti var: ağzı təmizləyir, Allahı razı salır, şeytanı qəzəbləndirir, ər-Rəhman və mələklər onu sevir, damaqları möhkəmləndirir, bəlğəmi aradan qaldırır, ağızda gözəl qoxu yaradır, acılığı məhv edir, görmə qabiliyyətini gücləndirir, ağızdan xoşagəlməz qoxunu aparır və bu sünnədən sayılır".

❁❁❁

Əbu Bəkr əs-Siddiq رضي الله عنه demişdir: "Əgər Allah kiməsə on xüsusiyyət vermiş olarsa, həmin şəxs hər növ kədər və bədbəxtlikdən yaxa qurtarmış olar və o Allaha yaxın və müttəqi olan şəxslərin dərəcələrinə yüksələr.

– Qənaətcil qəlblə birgə daimi düzgünlük;
– Daimi şükürlə birgə olan kamil səbir;
– Zühdlə birgə olan daimi kasıblıq;
– Ac qarınla birgə olan daimi düşüncə;
– Daimi qorxu ilə birgə olan kədər;
– Daimi çalışqanlıqla birgə olan təvazökar bədən;
– Mərhəmətlə birgə daimi xoş rəftar;
– Həya ilə birgə olan daimi sevgi;
– Daimi anlamaq ilə olan elm;
– Sabit ağılla birgə olan daimi iman".

❁❁❁

Ömər رضي الله عنه demişdir: "On şey olmadan on şey düzəlməz: qorxu olmadan ağıl, elm olmadan fəzilət, qorxusuz

qələbə, adillik olmadan hökmranlıq, ədəb olmadan hörmət olmaz, əmin-amanlıq olmadan sevinc də olmaz, təvazökarlıq olmadan ucalmaq olmaz və müvəffəqiyyət olmadan cihad olmaz”.

❁❁❁

Osman ﷺ demişdir: “Ən pis hallar ondur: haqqında soruşulmayan alim, əməl olunmayan elm, qəbul olunmayan doğru rəy, istifadə olunmayan silah, içərisində namaz qılınmayan məscid, oxunulmayan Quran, xeyrə xərclənməyən pul, minilməyən at, dünya sevər şəxsdə olan zühd elmi, uzaq səfər üçün lazımi tədarük görülmədən yaşanılan həyat”.

❁❁❁

Əli ﷺ demişdir: “Ən yaxşı elm mirasdır, ən yaxşı xüsusiyyət ədəb-ərkandır, ən yaxşı əmtəə ibadətdir, ən yaxşı başçı yaxşı əməllərdir, ən yaxşı həmkar gözəl əxlaqdır, ən yaxşı vəzir düzgün olmaqdır, ən yaxşı var-dövlət qənaətdir, ən yaxşı kömək müvəffəqiyyətdir və ən yaxşı tərbiyəçi ölümdür”.

❁❁❁

Peyğəmbər ﷺ demişdir: “Bu ümmətdə on növ insan var ki, onlar özlərini mömin saymaqlarına baxmayaraq Allah yanında küfr etmiş sayılırlar: haqsız yerə insan qətlə yetirən, sehrbaz, ailəsinə, namusuna əhəmiyyət verməyən dəyyus, zəkat verməyən kəs, içki içən, imkanı olub həccə getməyən, fitnə-fəsad yayan, düşmənlərə silah satan, qa-

dınına arxadan yaxınlaşan, məhrəmi ilə nikah bağlayan insan bu əməlləri halal hesab edərsə kafir olar".

❁❁❁

Peyğəmbər ﷺ demişdir: "Başqaları ilə gözəl münasibətdə olmayan kəs yerdə və ya göydə mömin olmaz, müsəlman olmayınca başqaları ilə münasibətdə olmaz, insanlar onun əlindən və ya dilindən salamat olmayınca müsəlman olmaz, elmli olmayınca müsəlman olmaz, elminə əməl etməyincə alim olmaz, təqvalı olmayınca zahid olmaz, təvazökar olmayınca təqvalı olmaz, özünü tanımayınca təvazökar olmaz, danışığını bilməyincə də özünü tanımış olmaz".

❁❁❁

Deyirlər ki, bir dəfə Yəhya ibn Müaz ər-Razi dünyasevər bir alim görüb ona dedi: "Ey elm sahibi, sizin qəsrləriniz (Rum imperatoru) Qeysərin qəsrləri kimi, evləriniz (Fars imperatoru) Xosrovun evləri kimi, məskənləriniz (Orta Asiya hökmdarı) Qarunun məskəni kimi, qapılarınız (İsrail oğullarına zülm vermiş) Talutun qapıları kimi, malikanəniz Maridlərin malikanəsi kimi, hakimiyyətiniz Fironun hakimiyyəti kimi, fitvalarınız dünya və rüşvət naminədir, belə olduğunuz halda cahiliyyət ölümünə məhkumsunuz. Bəs Muhəmmədin ﷺ dini harada qaldı?!"

❁❁❁

Şair demişdir:

Ey Rəbbini müxtəlif sözlərlə çağıran,

Və Cənnətdə "Darus-Salamda" məskən axtaran,
Ey tövbəni ildən-ilə təxirə salan,
Səni özünə qarşı çox səmimi görürəm.
Ey qafil əgər sən gününü orucla keçirsən,
Gecəni isə qiyamla bitirsən,
Yeməyini, içməyini imkan qədər azaltsan,
Şərəfli bir məqama layiq olarsan.
Bundan əlavə Rəbbinin kəramətinə,
İzzət və Cəlal Sahibinin böyük razılığına vararsan.

❁❁❁

Bəzi müdrik şəxslər demişlər: "Uca Allah on şəxsdə on xüsusiyyətin olmasını sevməz: varlının paxıl olmasını, kasıbın təkəbbürlü olmasını, alimin tamahkar olmasını, qadının həyasız olmasını, yaşlının dünyanı sevməsini, cavanın tənbəl olmasını, hökmdarın zalım olmasını, döyüşçünün qorxaq olmasını, zahidin özünü bəyənməsini və abidin riyakar olmasını sevməz".

❁❁❁

Peyğəmbər ﷺ demişdir: "Salamatlığın on növü var, beşi bu dünyada, beşi isə axirətdədir. Dünyada olan növlər: elm, ibadət, halal ruzi, çətin vaxtda səbirli olmaq və nemətə şükür etmək. Axirətdə olanlar isə bunlardır: ölüm mələyinin mərhəmət və lütflə gəlməsi, məzarda münkərlə nəkirdən qorxmamaq, Qiyamət günü arxayın olmaq, günahlarının silinməsi və savablarının qəbul olunması, sirat körpüsündən ildırım sürəti ilə keçmək və Cənnətə salamat olaraq daxil olmaq".

❁❁❁

Əbul-Fədl demişdir: "Uca Allah Öz kitabını on cür adlandırmışdır: Quran, Furqan, Kitab, Tənzil, Hudə, Nur, Rəhmət, Şəfa, Ruh və Zikr. Quran, Furqan, əl-Kitab və Tənzil məşhurdur. Hudə, Nur, Rəhmət və Səfa barədə Uca Allah buyurmuşdur: **"Ey insanlar, Rəbbinizdən sizə moizə, qəlblərə şəfa verən, möminlər üçün hidayət və rəhmət olan (Quran) gəlmişdir"[18], "Allahdan sizə nur və açıq-aydın bir kitab gəlmişdir"[19],** ruh barəsində isə buyurur: **"Həmçinin Biz sizə bir ruh göndərdik"[20],** zikr barədə isə buyurur: **"İnsanlara açıqlamaq üçün sənə zikri nazil etdik"[21].**

❁❁❁

Loğman öz oğluna belə demişdir: "On əməli etmək hikmətdən sayılır: ölmüş qəlbi diriltmək, kasıblarla birgə olmaq, hökmdarların məclislərindən çəkinmək, adi insanları yüksəltmək, kölələri azad etmək, qəribi qonaq etmək, kasıbı varlandırmaq və hörmətli şəxslərə hörməti artırıb ehtiram göstərmək. Bütün bunlar mal-dövlətdən daha xeyirlidir. Bu xüsusiyyətlər insanı qorxudan qurtarır, insana müharibədə dayaq olur və qazanc gətirən ticarət sayılır. Qorxulu bir gündə insanı müdafiə edəcək. Bu yəqinliyin insanın nəfsinə birləşməsinə dəlildir və bu heç bir örtük olmadığını bir zamanda insanda örtük olar".

❁❁❁

---

18 "Yunus" surəsi, 57.
19 "əl-Maidə" surəsi, 15.
20 "əş-Şura" surəsi, 52.
21 "ən-Nəhl" surəsi, 44.

Bəzi hikmət sahibləri demişlər: “Aqil insan tövbə edən zaman on əməl etməlidir: dili ilə bağışlanma diləməli, qəlbi ilə peşman olmalı, bədəni ilə (günahlardan) uzaqlaşmalı. Bir daha həmin günaha qayıtmamaq əzmində olmalı. Axirəti sevməli, dünyaya nifrət etməli. Az danışmalı, elm və ibadətlə məşğul olmaq naminə yemək-içməyi azaltmalı və az yatmalıdır. Uca Allah buyurur: **“Onlar gecənin az bir hissəsini yatar, sübh vaxtlarında isə *Allahdan* bağışlanma diləyərlər”.**[22]

❁❁❁

Ənəs ibn Malik ﵁ demişdir: “Hər gün yer çağıraraq deyir: Ey Adəm övladı mənim üzərimdə gəzirsən, qayıdışın isə mənim daxilimədir, mənim üzərimdə gülürsən, mənim daxilimdə ağlayırsan, mənim üzərimdə sevinirsən, mənim daxilimdə isə kədərlənirsən, mənim üzərimdə mal-dövlət toplayırsan, mənim daxilimdə isə peşman olursan, mənim üzərimdə haram yeyirsən, mənim daxilimdə isə qurdlar sənin özünü yeyir, mənim üzərimdə lovğalanırsan, mənim daxilimdə isə alçalırsan, mənim üzərimdə sevinclə gəzirsən, mənim daxilimdə isə kədərlənirsən, mənim üzərimdə nurla gəzirsən, mənim daxilimdə isə zülmətlərə qərq olursan, mənim üzərimdə camaatla gedirsən, daxilimdə isə tənha qalırsan”.

❁❁❁

Peyğəmbər ﷺ demişdir: “Çox gülən adama on cür cəza verilər: Qəlbi ölər; Üzünün həyası gedər; Şeytanı sevin-

---

[22] “əz-Zariyat” surəsi, 17-18.

dirər; Rəhmanı qəzəbləndirər; Qiyamət günü onunla münaqişə olunar; Qiyamət günü Peyğəmbər ﷺ ondan üz döndərər; mələklər onu lənətləyər; Yerin və səmaların sakinləri ondan üz çevirər; O hər şeyi unudar; Qiyamət günü rüsvay olar".

❁❁❁

Həsən əl-Bəsri demişdir: "Bir gün mən abid bir cavan oğlanla birgə Bəsrə şəhərinin küçələrini və bazarlarını gəzib dolaşarkən bir həkimlə rastlaşdıq. O kürsüdə oturmuş qabağında isə kişilər, qadınlar və uşaqlar əllərində bir qab su tutaraq gözləyirdilər. Onların hər biri öz xəstəliyini vəsf edərək ona əlac axtarırdı. Birdən gənc bir oğlan həkimə yaxınlaşıb soruşdu: Ey həkim səndə günahları yuyan və qəlblərə şəfa verən bir dərman varmı?" O dedi: "Bəli". Cavan oğlan: "Ver!"– dedi. Həkim dedi: Məndən on şeyi götür: kasıblıqla təvazökarlıq ağaclarının köklərini götür, onun içərisinə tövbə bitkisini də qoy, sonra onu təqva qabına qoy və üzərinə həya suyu əlavə et, sonra onu məhəbbət odu ilə yandır, sonra onu şükr qədəhinə qoy, sonra onu Allahın istəyinə burax, sonra da onu həmd qaşığı ilə iç, əgər sən bütün bunları etsən həm dünyada, həm də axirətdə bu sənə fayda verər".

❁❁❁

Rəvayət olunur ki, bir padşah beş alim və müdrik şəxsi bir yerə toplayaraq onlardan hər birinin bir hikmət deməsini istəyibmiş. Onların hər biri iki hikmətli söz demiş, bu da on olmuşdur:

Birinci dedi: "Yaradandan qorxmaq əmin-amanlıqdır, əmin olmaq isə küfrdür, habelə məxluqdan əmin olmaq azad qalmaq, ondan qorxmaq isə qul olmaq kimidir".

İkinci dedi: "Allahdan istəmək var-dövlətdir və belə edənə yoxsulluq təsir etməz, habelə Allahdan ümidini üzmək yoxsulluqdur və belə edənə var-dövlət fayda verməz".

Üçüncü dedi: Yoxsulluq qəlbi zəngin olan kəsə zərər yetirməz, həmçinin qəlb yoxsul olarsa var-dövlətin çoxluğu faydasız olar".

Dördüncü dedi: Yaxşı işlər qəlbi daha zənginləşdirir, qəlbin yoxsulluğu insanı daha da kasıblaşdırır".

Beşinci dedi: Xeyirdən az miqdarda götürmək, şərin çoxunu tərk etməkdən yaxşıdır, şərin hamısını tərk etmək az miqdarda xeyir götürməkdən daha xeyirlidir.

❁❁❁

Peyğəmbər ﷺ demişdir: "Ümmətimdən on qrup insan var ki, onlar tövbə etməsələr Cənnətə daxil ola bilməyəcəklər: Qallə, Cəyuf, Fəffat, Dəbub, Dəyyus, Artəbəli, Kubəli, Utul, Zənim və valideyninin üzünə ağ olan". Soruşdular: "Ey Allahın rəsulu Qallə nədir?" Dedi: "Hökmdarların yanında gəzən". Soruşdular: "Cəyuf nədir:" Dedi: "qəbirstanlıqdan oğurluq edən". Soruşdular: "Fəffat nədir?" Dedi: "Söz gəzdirən". Soruşdular: "Bəs Dəbub nədir?" Dedi: "Evinə qızları yığıb onlara təcavüz edən". Soruşdular: "Dəyyus nədir?" Dedi: "Ailəsinin qeyrətini çəkməyən". Soruşdular: "Bəs Artabəli nədir?" Dedi: "Zərb çalan". Soruşdular: "Bəs Utul nədir?" Dedi: "Günahları ba-

ğışlamayan və üzrxahlıq qəbul etməyən". Soruşdular: "Zənim nədir?" Dedi: "Zinadan əmələ gələn övladın, yolun qırağında durub insanların qeybətini etməsidir. Valideynlərin üzünə ağ olan isə məlum məsələdir".

❁❁❁

Peyğəmbər ﷺ demişdir: "On nəfərin Uca Allah namazını qəbul etməz: təklikdə qiraətsiz namaz qılanın, zəkat verməyənin, insanların bunu istəməməsinə rəğmən onlara imamlıq edənin, sahibinin yanından qaçan kölənin, içki içib sərxoş olanın, ərini qəzəbləndirib gecələyən qadının, hicabsız namaz qılan azad qadının, sələm yeyənin, zalım başçının və namaz qılaraq pisliklərdən və münkər əməllərdən çəkinməyən və Allahdan üzaqlaşan şəxsin".

❁❁❁

Peyğəmbər ﷺ demişdir: "Məscidə daxil olan şəxs on xüsusiyyətə malik olmalıdır: ayaqqabılarını və ya xüflərini təmiz saxlamalı və onları çıxarmalı, sağ ayaqla daxil olmalı, daxil olduqda "bismillah" deyib Rəsulullaha və mələklərə salam verməli və "Allahım rəhmət qapılarını mənim üzümə aç, həqiqətən də Sən *xeyir* bəxş edənsən" deməli, məsciddəkilərə salam verməli, məsciddə heç kim olmadıqda "Bizə və bütün əməlisaleh bəndələrə salam olsun" deməli, habelə "Əşhədu ən lə illahə illəllah və ənnə Muhəmmədən rəsulullah" deməli, namaz qılanların önündən keçməməli, dünya əməllərindən və dünyəvi söhbətlərdən çəkinməli, iki rükət namaz qılmadan oranı tərk etməməli, dəstəmazsız məscidə daxil olmamalı, qalxdıqda "Allahım

sən nöqsansızsan, Sənə həmd edərək şahidlik edirəm ki, Səndən başqa ibadətə layiq haqq məbud yoxdur, Səndən bağışlanma diləyir və tövbə edirəm".

❁❁❁

Peyğəmbər ﷺ demişdir: "Namaz dinin dirəyidir və onun on xüsusiyyəti var: Üzü gözəlləşdirir, qəlbi nurlandırır, bədənə rahatlıq verir, qəbirdə yardımçı olur, mərhəmət nazil edir, səmanın açarıdır, Mizan tərəzisində ağır gəlir, Rəbbi razı salır, Cənnətin qiymətidir, Cəhənnəm odundan sipərdir, namazı icra edən dini qaldırmış olar, onu tərk etmək isə dini tarimar etmək deməkdir".

❁❁❁

Aişə رضي الله عنها rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Uca Allah Cənnət əhlini Cənnətə daxil etmək istədikdə onlara bir mələk yollayar, həmin mələk də onlara hədiyyə və Cənnət geyimi gətirər. Onlar Cənnətə daxil olmaq istədikdə mələk deyər: Dayanın! Məndə sizin üçün Aləmlərin Rəbbindən hədiyyə var. Onlar soruşarlar: "O nə hədiyyədir elə?" Mələk deyər: "Hədiyyə on ədəd üzükdür, onlardan birinin üzərinə bu sözlər yazılıb: **"Sizə salam olsun, oraya əbədi olaraq daxil olun"[23]**. İkincidə bu sözlər yazılıb: "Kədər və qəm artıq sizdən götürülmüşdür". Üçüncüdə isə bunlar yazılmışdır: **"Bu etdiyiniz əməllərin müqabilində sizə miras qalan həmin Cənnətdir"[24].** Dördüncü-

[23] "əz-Zumər" surəsi, 73.
[24] "əl-Əraf" surəsi, 42.

də isə yazılmışdır: “Biz sizi gözəl libaslar və zinətlər bəxş etdik”. Beşincidə isə yazılmışdır: **“Biz sizi göz oxşayan hurilərlə evləndirərik”[25], “Mən onları səbir etdiklərinə görə mükafatlandırıram, həqiqətən də onlar qələbə çalanlardır”[26].** Altıncı da isə yazılmışdır ki: “Bunlar etdiyiniz itaətlərin müqabilindədir”. Yeddincidə isə yazılmışdır: “artıq siz gənc olacaq və heç bir zaman qocalmayacaqsınız”. Səkkizincidə isə yazılmışdır: “Siz əmin-amanlıq içərisində olacaq və heç bir vaxt qorxu hisləri keçirməyəcəksiniz”. Doqquzuncu da isə yazılmışdır: “Siz peyğəmbərlər, sadiqlər, şəhidlər və salehlərə dost olacaqsınız”. Onuncuda isə yazılmışdır: “Əzəmətli ərşin yaxınlığında ər-Rəhmana yaxın olun”. Sonra mələk deyir: **“Salamat və əmin-amanlıqla ora daxil olun”[27].** Onlar da Cənnətə daxil olaraq deyirlər: **“Bizdən qəm-qüssəni aparan Allaha həmd olsun, həqiqətən də Rəbbimiz bağışlayan və şükürə layiqdir”[28], “Vədinə sadiq olan, bizə yeri miras qoyan və Cənnətdə istədiyimiz yeri bizə bəxş edən Allaha həmd olsun, əməl edənlərin mükafatı necə də gözəldir”[29].**

❁❁❁

Habelə Uca Allah Cəhənnəm əhlini ora daxil etmək istədikdə on üzüklə bir mələk göndərir. Birinci üzükdə

---

25 “əd-Duxan” surəsi, 54.
26 “əl-Muminun” surəsi, 111.
27 “əl-Hicr” surəsi, 46.
28 “əl-Fatir” surəsi, 34.
29 “əz-Zumər” surəsi, 74.

bunlar yazılır: “Oraya daxil olun! Siz nə öləcək, nə diriləcək, nə də oradan çıxarılmayacaqsınız”. İkinci üzükdə isə bunlar yazılır: “Əzaba qovuşun, siz rahatlıq tapmayacaqsınız”. Üçüncüdə isə yazılmışdır: “Mənim rəhmətimdən ümidinizi üzün”. Dördüncüdə isə yazılmışdır: “Əbədi qəm-qüssə və kədər içərisində oraya daxil olun”. Beşincidə isə yazılmışdır: “Sizin libasınız od, yeməyiniz Zəqqum, içkiniz Həmim, sığınacağınız od, örtüyünüz də od olacaqdır”. Altıncıda isə yazılmışdır: “Mənə qarşı etdiyiniz asiliklərin müqabilindəki cəzanız budur”. Yeddincidə isə yazılmışdır: “Cəhənnəmdə əbədi olaraq Mənim qəzəbim sizin üzərinizdə olacaq”. Səkkizincidə isə yazılmışdır: “Qəsdən böyük günah işlər görüb, tövbə etməyib peşman olmadığınız üçün sizlərə lənət olsun”. Doqquzuncuda isə yazılmışdır: “Cəhənnəmdə daimi olaraq sizin dostlarınız şeytanlar olacaqdır”. Onuncuda isə yazılmışdır: “Şeytana uydunuz, dünyanı istədiniz və axirəti tərk etdiniz, bu da sizin payınız”.

❁❁❁

Bəzi müdrik şəxslər demişlər: “On şeyi on yerdə axtardım, başqa on yerdə tapdım: Ucalığımı lovğalıqda axtardım, təvazökarlıqda tapdım, ibadəti namazda axtardım, təqvada tapdım, rahatlığı hərislikdə axtardım, zahidlikdə tapdım, qəlbin nurunu gündüz vaxtı qılınan namazlarda axtardım, gecə qılınan namazlarda tapdım, Qiyamətin nurunu yaxşılıq və səxavətdə axtardım, susuzluq və orucda tapdım, sirat körpüsünü keçməyi qurban kəsmək-

də axtardım, sədəqədə tapdım, Cəhənnəm odundan yaxa qurtarmağın yolunu mübah əməllərdə axtardım, şəhvətləri tərk etməkdə tapdım, dünyada Uca Allahı sevməyin yolunu axtardım, Allahı zikr etməkdə tapdım, toplumlardan salamatlıq axtardım, təklikdə tapdım, qəlbin nurunu moizələrdə və Quran oxumaqda axtardım, təfəkkürdə və ağlamaqda tapdım".

❁❁❁

İbn Abbas رضي الله عنهما Uca Allahın "Bir zaman Rəbbi İbrahimi bəzi sözlərlə imtahan etmiş, o da onları tamamlamışdır"- ayəsi barədə demişdir: "On xüsusiyyət sünnədən sayılır, onların beşi başda, beşi isə bədəndədir. Başda olanlar: Misvak, ağızı yaxalamaq, burunu təmizləmək, bığları qısaltmaq və saçı qırxdırmaqdır. Bədəndə olanlar isə bunlardır: qoltuq altını təmizləmək, dırnaqları kəsmək, qasığı təmizləmək, sünnət etmək və təbii ehtiyacı rəf etdikdən sonra təmizlənmək".

❁❁❁

İbn Abbas رضي الله عنهما demişdir: "Kim Peyğəmbərə ﷺ bir dəfə salavat göndərsə Allah ona on dəfə salavat göndərər və kim onu bir dəfə təhqir edərsə, Allah onu on dəfə təhqir edər. Məgər görmürsən ki Valid ibn Muğira Peyğəmbəri ﷺ bir dəfə təhqir etmiş ikən Allah onu on dəfə təhqir edərək demişdir: **"Müşriklər istəyirlər ki, sən onlara güzəşt edəsən, onlar da sənə güzəşt etsinlər. İtaət etmə hər tez-tez and içənə, alçağa, qeybət edənə, dedi-qodu yayana, xeyrə mane olana, həddi aşana, günahkara, daş ürəkliyə**

**bunlardan sonra da başqasının adını mənimsəyən fırıldaqçıya. O adam var-dövlət və oğul uşaq sahibi olsa belə ayələrimiz ona oxunduğu zaman "Bu, keçmişdəkilərin əsatirlərindəndir" deyər".**

❁❁❁

İbrahim ibn Ədhəmdən Allahın: **"Mənə dua edin, mən də sizə cavab verim"** ayəsi barəsində soruşdular. O dedi: "Qəlbləriniz on şeydən ölür:

– Siz Allahı tanıyıb onun haqqlarını vermirsiniz;

– Allahın Kitabını oxuyub ona əməl etmirsiniz;

– İblisə düşmən olduğunu iddia edib onunla dostluq etdiniz;

– Peyğəmbəri ﷺ sevdiyinizi iddia edib onun sünnətini tərk etdiniz;

– Cənnəti sevdiyinizi iddia edib onun üçün can atmadınız;

– Cəhənnəmdən qorxduğunuzu iddia edib günahlardan çəkinmədiniz;

– Ölümün haqq olduğunu bilib ona tədarük görmədiniz;

– Öz ayıblarınızı unudub, başqalarının ayıblarını aradınız;

– Allahın ruzisini yeyib, Ona şükr etmədiniz;

– Ölülərinizi basdırıb ibrət götürmədiniz".

❁❁❁

Peyğəmbər ﷺ demişdir: "Kim Ərəfat gecəsi bu duanı min dəfə edərsə Allah ona dilədiyi hər şeyi verər. Yalnız

qohumluq əlaqələrini kəsən müstəsnadır:

– Ərşi səmada olan Allah nöqsansızdır
– Mülkü və qüdrəti yerdə olan Allah nöqsansızdır
– Yolu quruda olan Allah nöqsansızdır
– Ruhu havada olan Allah nöqsansızdır
– Odda sultanlığı olan Allah nöqsansızdır
– Elmi bətnlərdə olan Allah nöqsansızdır
– Qəbirlərdə hökmü olan Allah nöqsansızdır
– Göyü dayaqsız olaraq qaldıran Allah nöqsansızdır
– Yeri yaradan Allah nöqsansızdır
– Özündən başqa heç bir dönüş yeri və sığınacaq olmayan Allah nöqsansızdır”.

❃❃❃

İbn Abbas رضي الله عنهما rəvayət edir ki, bir gün Rəsulullah ﷺ lənətə gəlmiş İblisə dedi: “Mənim ümmətimdən sənə sevimli olan kəslər kimlərdir?” O dedi: “On nəfər: zülmkar başçı, təkəbbürlü kimsə, mal-dövlətinin haradan gəlib, hara sərf olunduğuna əhəmiyyət verməyən varlı, başçının zülmünə inanan alim, xain ticarətçi, inhisarçı, zinakar, sələm yeyən, haradan pul yığmasına əhəmiyyət verməyən paxıl, içki içib sərxoşluq edən adam”. Sonra Peyğəmbər ﷺ soruşdu: “Bəs mənim ümmətimdən düşmənlərin nə qədərdir?” O dedi: “İyirmi nəfər. Onların başçısı sənsən ey Muhəmməd, mən sənə nifrət edirəm, habelə elminə əməl edən alim, Quranı öyrənib ona əməl edən, beş vaxt namaz üçün azan verən, yetimləri, kasıbları və yoxsulları sevən kəs mərhəmətli qəlbə sahib olan kəs, haqqa qarşı təvazökar olan, Allaha itaətdə bö-

yüyüb boya-başa çatan kəs, halal yeyən, bir-birini Allah üçün sevən gənclər, camaat namazına həris olan kəs, gecə insanlar yatmış ikən namaz qılan, özünü haramdan qoruyub saxlayan, qəlbində heç bir şey olmadan dua edən kəs, daima dəstəmazlı olan, səxavətli şəxs, gözəl əxlaqlı kəs, Allahın ona əmanət verdiyi kəsə inanan namuslu, dul qadınlara köməklik göstərən və ölümə hazırlaşan adam".

❁❁❁

Vahb ibn Münəbbih demişdir: "Tövratda yazılıb ki, dünyada ikən tədarük görən Qiyamət günü Allahın əzabından əmin-amanlıqda olar".

- Həsədi tərk edən şəxs Qiyamət günü məxluqatın önündə təriflənər.
- Vəzifə sevgisini tərk edən kəs Qiyamət günü Yenilməz qüvvət Sahibinin yanında qüvvətli olar.
- Dünyada qədərindən artıq şeylərdən çəkinən şəxs yaxşı insanlardan olar.
- Dünyada mübahisə etməkdən uzaq olan kəs, Qiyamət günü nicata çatmışlardan olar.
- Bu dünyada xəsislik etməyi tərk edən, məxluqatın başında xatırlanar.
- Bu dünyada rahatlığı tərk edən kəs Qiyamətdə sevinc içərisində olar.
- Bu dünyada haramı tərk edən kəs Qiyamət günü peyğəmbərlərə qonşu olar.
- Dünyada harama baxmağı tərk edən kəsi, Allah axirətdə sevindirər.

- Kim bu dünyada var-dövləti tərk edib kasıblığı özünə tərcih edərsə, Qiyamət günü Allah onu peyğəmbər və övliyalarla bir yerdə həşr edər.
- Kim bu dünyada insanların ehtiyaclarını ödəyərsə, Allah onu həm bu dünyada, həm də axirətdə ehtiyaclarını ödəyər.
- Kim qəbirdə ona yardımçının olmasını istəyirsə, gecələr qalxıb namaz qılsın.
- Rəhmanın ərşinin kölgəsində olmaq istəyən kəs şəhid olsun.
- Kim haqq-hesabının yüngül olmasını istəyirsə özünə və qardaşlarına nəsihətlər versin.
- Kim mələklərin onu ziyarət etməsini istəyirsə təqvalı olsun.
- Kim Cənnətin heyrətamiz guşələrində məskunlaşmaq istəyirsə gecə-gündüz Allahı zikr etsin.
- Kim haqq-hesabsız Cənnətə daxil olmağı istəyirsə Allaha səmimi qəlbdən tövbə etsin.
- Kim varlı olmaq istəyirsə, Allahın ona bəxş etdiyi nemətlərdən razı olsun.
- Kim Allahla əzəmətini dərk etmək istəyirsə Ondan qorxsun.
- Hikmətli olmağını istəyən kəs gərək elmli olsun.
- Kim insanlardan salamat olmaq istəyirsə heç kəs haqda pis bir şey danışmasın və insanlara nədən yarandıqlarını və nə üçün yarandıqlarını xatırlatsın.
- Kim həm dünyada, həm də axirətdə şərəfə çatmaq istəyirsə axirəti dünyadan üstün tutsun.

- Kim Firdovs cənnətlərini və daimi nemətləri diləyirsə ömrünü faydasız işlərə sərf etməsin.
- Kim həm dünyada, həm də axirətdə Cənnətə qovuşmaq istəyirsə səxavətli olsun. Belə ki, səxavət Cənnətə yaxın, cəhənnəmdən isə uzaq bir əməldir.
- Kim qəlbinin tam bir nurla işıqlanmasını istəyirsə çox fikirləşsin.
- Kim səbirli bədənə, zikr edən dilə, qorxan qəlbə malik olmaq istəyirsə mömin və müsəlman kişi və qadınlar üçün Allahdan bağışlanma diləsin.

# Mündəricat